# ÖYRƏN - ÖYRƏT

https://archive.org/details/@oyrenoyret2021

DİNİ VƏ ELMİ HƏQİQƏTLƏR - 1



*De: "Mən bunun müqabilində sizdən heç bir əvəz istəmirəm. Yalnız Rəbbinə doğru bir yol tutmaq istəyən kimsələr olmalarını istəyirəm."*
*(Furqan surəsi, 57)*

## İÇİNDƏKİ BÖLÜMLƏR:



oyrenoyret2021@gmail.com

# Kainatın Əmələ Gəlməsi

XX əsrin əvvəllərinə qədər hakim olan fikir kainatın sonsuz ölçülərə malik olması, sonsuzdan bəri var olduğu və sonsuza qədər də var olacağı şəklində idi. “Statik kainat modeli” adı verilən bu anlayışa görə, kainat üçün hər hansı bir başlanğıc və ya son yoxdur. Materialist fəlsəfənin də əsasını təşkil edən bu fikir kainatı sabit və dəyişməyən maddələr yığını olaraq qəbul edərək hər hansı bir Yaradanın varlığını da rədd edirdi. Halbuki, XX əsrdə inkişaf edən elm və texnologiya materializmin bünövrəsi hesab edilən sabit kainat modelini kökündən darmadağın etdi.

Kainatın başlanğıcının olmasını XXI əsrin əvvəllərində yaşadığımız bu dövrdə müasir fizika müxtəlif müşahidə, təcrübə və hesablarla sübut edib. Bundan başqa, kainatın materialistlərin iddia etdikləri kimi sabit və statik olmadığı, əksinə, hər an hərəkət etdiyi, dəyişdiyi və genişləndiyi də təsdiq edilib. Bu gün bu həqiqətlər bütün elm dünyası tərəfindən qəbul edilir. Qurani-kərimdə kainatın meydana gəlməsi ilə bağlı bunlar bildirilir:

**“O, göyləri və yeri (yoxdan) var edəndir...” (Ənam surəsi, 101)**



Quranda öz əksini tapan bu məlumat müasir elmin kəşfləri ilə üst-üstə düşür. Yuxarıda da qeyd etdiyimiz kimi, çağdaş astrofizika bütün kainatın özünün maddə və zaman ölçüləri ilə birlikdə sıfır anında böyük bir partlayışla meydana gəldiyi qənaətindədir. “Böyük partlayış” və ya əsl adı ilə desək, “Biq bənq” (Big bang) nəzəriyyəsi bütün kainatın təxminən 15 milyard il əvvəl bir nöqtənin partlaması nəticəsində yoxdan var olduğunu sübut etmişdir.

“Biq bənq”dən əvvəl maddə deyilən bir nəsnə yox idi. Maddənin, enerjinin, hətta zamanın da olmadığı, tamamilə metafizika olaraq adlandıra biləcəyimiz bir yoxluq şəraitində maddə, enerji və zaman bir anda yaradılmışdır. Müasir fizikanın elmi şəkildə sübuta yetirdiyi bu böyük həqiqət Quranda bizə hələ 1400 il bundan əvvəl xəbər verilib!

# Geri Qaytaran Göy

Qurani-kərimdə “Tariq” surəsinin 11-ci ayəsində göy üzünün “geri hərəkət etdirə bilmək” xüsusiyyətindən belə bəhs edilir:

**“And olsun qaytarıb endirən səmaya...” (Tariq surəsi, 11)**

Quran tərcümələrində “qaytarmaq” şəklində tərcümə edilən “rəci” kəlməsi “geri qaytaran” və ya “geri dövr etdirən” mənalarına gəlir.

Məlum olduğu kimi, Yeri əhatə edən atmosfer müxtəlif qatlardan ibarətdir. Yerdə həyatın davam etməsi üçün hər təbəqənin mühüm vəzifələri var. Bu məsələ ilə bağlı incələmə aparılanda məlum olur ki, hər təbəqəyə gələn maddə və şüaların kosmosa və ya Yerə geri qaytarmaq xüsusiyyəti var. Atmosfer təbəqələrinin geri qaytarmaq xüsusiyyətini burada bir neçə nümunənin əsasında tədqiq etməyə çalışaq. Məsələn, 13-15 km yüksəklikdəki troposfer təbəqəsi Yerdən yüksələn su buxarının soyuyub, qalınlaşıb, sıxlaşıb yağış formasında geri qayıtmasını təmin edir. 25 km yüksəklikdəki stratosferin aşağı təbəqəsi olan ozonosfer kosmosdan gələn radiasiyanı və zərərli ultrabənövşəyi şüaları əks etdirir və onların Yerə çatmadan kosmosa geri qayıtmasını təmin edir. İonosfer təbəqəsi də Yerdən yayılan radio dalğaları bir peyk kimi Yerin müxtəlif bölgələrinə geri əks etdirərək, radio və

televiziya yayımlarına uzaq məsafələrdən baxılmasını, simsiz danışıqların ötürülməsini təmin edir. Manyetosfer təbəqəsi isə Günəşdən və başqa ulduzlardan yayılan zərərli radioaktiv hissələri Yerə çatmağa qoymayaraq onları geriyə - kosmosa qaytarır.




Göy üzü təbəqələrinin hələ yaxın keçmişdə kəşf edilən bu xüsusiyyətinin Quranda əsrlərlə bundan əvvəl bildirilməsi Quranın Allah`ın sözü olduğunu bir daha sübut edir.

## Dünyanın Dairəvi Olması

**“Göyləri və yeri haqq olaraq yaratdı. O, gecəni gündüzün, gündüzü də gecənin üstünə sarıb örtür... ” (Zumər surəsi, 5)**

Quranın kainatı tanıdan ayələrində istifadə olunmuş ifadələr kifayət qədər diqqət çəkicidir. Yuxarıdakı ayədə “sarıb örtmək” kimi tərcümə edilən ərəb kəlməsi “yukəvviru”dur. Bu kəlmənin Azərbaycan dilindəki qarşılığı “dairəvi bir şeyin üzərinə bir cisim örtmək”dir. (Məsələn, ərəb dili lüğətlərində “başa əmmamə sarımaq” kimi dəyirmi cisimlərlə bağlı olan feillər bu kökdən əmələ gələn sözlərlə işlədilir).

Ayədə gecə ilə gündüzün bir-birinin üzərini sarıb örtməsi (“təkvir” etməsi) mövzusunda verilən bilik, eyni zamanda, dünyanın quruluşu haqqında səhih və dolğun məlumat verə bilər. Yəni VII əsrdə nazil edilən Quranda Yerin dairəvi olduğuna işarə edilmişdir.

Unutmaq olmaz ki, o dövrdəki astronomiya dünyanı daha fərqli şəkildə və səviyyədə təsəvvür edirdi. O dövrdə



belə hesab edirdilər ki, Yer düz səthə malikdir. Bütün elmi hesablama və açıqlamalar da buna nəzərən qurulurdu. Ancaq Quran Allah`ın sözü olaraq kainatı xarakterizə edərkən, burada sözügedən məsələ ilə bağlı ən doğru kəlmələrdən istifadə olunmuşdur. Yaxın əsrlərdə öyrəndiyimiz bu məlumatlar Quran ayələrində hələ 1400 il bundan əvvəl xəbər verilib.

## Dünyanın Geoit Forması

**“Bundan sonra da yeri döşəyib düzəltdi.” (Naziat surəsi, 30)**

Yuxarıdakı ayədə «döşəyib düzəltdi» kimi tərcümə edilən «dəha» sözü «yaymaq» mənasına gələn «dəhv» kəlməsinin kökündəndir. «Dəhv» kəlməsi «döşəmək, düzəltmək» mənalarına gəlsə də, daşıdığı məna baxımından sadə bir «döşəmək» feili deyil. Çünki bu kəlmə də yuvarlaq olaraq düzəltmək, döşəmək feillərini tərif etmək üçün işlədilir.

«Dəhv» kəlməsindən törəyən başqa sözlərdə də dəyirmilik, yuvarlaqlıq mənası var. Məsələn, uşaqların topu yerdəki bir çuxura salması, daş atıb çuxura atmaq yarışları, qozla oynanan oyun hamısı «dəhv» kəlməsi ilə ifadə edilir. Dəvəquşunun yuva qurmasına, yatacağı yerdəki daşları təmizləməsinə, yumurtladığı yerə və yumurtasına da bu köklərdən törəyən kəlmələr işlədilir.

Elə Yer kürəsinin forması da bir yumurtanı xatırladan yuvarlaqlıqdadır. Yer kürəsinin qütblərdən yastı kürəvarı forması «geoit» kimi ifadə edilir. Bu baxımdan ayədə «dəha» sözünün



işlədilməsi özündə Allah`ın Yer kürəsi haqqında verdiyi mühüm bir məlumatı ehtiva edir. İnsanların əsrlərlə Yer kürəsinin düz olduğunu düşünməsi və onun həqiqi formasının ancaq texnoloji imkanlar nəticəsində bilinməsi Quranın Allah`ın vəhyi olduğuna dair mühüm dəlillərdən biridir.

## Kainatdakı Mükəmməl Müvazinət

**"Yeddi göyü qat-qat yaradan Odur. Sən Rəhmanın yaratdığında heç bir uyğunsuzluq görməzsən. Bir gözünü qaldırıb bax, heç orada bir yarıq görə bilərsənmi?! Sonra gözünü qaldırıb iki dəfə bax. Göz orada zəif, yorğun düşərək yenə də sənə tərəf qayıdacaqdır". (Mülk surəsi, 3-4)**

Kainatdakı milyardlarla ulduz və qalaktika onlar üçün mükəmməl tarazlıqda təyin edilmiş oxları ətrafında hərəkət edirlər. Ulduzlar, planetlər və peyklər həm öz oxları ətrafında, həm də bağlı olduqları sistemlə birlikdə daimi hərəkətdədir. İçində bəzən hətta 200-300 milyard ulduz olan qalaktikalar bir-birinin arasından keçib gedirlər. Belə keçidlər zamanı kainatdakı böyük sistemi dağıdacaq heç bir toqquşma ola bilməz.

Kainatdakı sürəti bizim bildiyimiz ölçü, hesab və standartlarla müqayisə etmək çox çətindir. Milyardlarla, hətta trilyonlarla ton ağırlığındakı ulduzlar, planetlər, saysız dəyərləri ancaq riyaziyyatçıların başa düşəcəyi ölçüdə olan nəhəng qalaktikalar və qalaktika kümələri kosmosda fövqəltəbii sürətlə hərəkət edirlər. Məsələn, Yer kürəsi öz oxu ətrafında saatda 1670 km sürətlə hərəkət edir. Bu gün ən sürətli güllənin saatda təxminən 1800 km-lik bir sürətə malik olduğunu nəzərə alsaq, Yer kürəsinin sürətinin onun nəhəngliyinə baxmayaraq necə böyük olması aydınlaşar.

Dünyanın Günəş ətrafındakı sürəti isə güllənin sürətindən təxminən 60 dəfə çoxdur - saatda 108000 km! (Bu cür böyük sürətlə hərəkət edən bir nəqliyyat vasitəsi düzəldilsəydi, o, Yer kürəsinin ətrafında 22 dəqiqəyə dolana bilərdi).

Bu rəqəmlər ancaq Yer kürəsi ilə bağlıdır. Günəş sistemi isə daha heyrətamiz və möcüzəlidir. Bu sistemin sürəti idrak və məntiq çərçivələrini də aşacaq səviyyədə yüksəkdir. Kainatdakı sistemlər böyüdükcə sürət də çoxalır. Yer kürəsinin Günəş sisteminin qalaktika mərkəzi ətrafındakı sürəti saatda 720 000 kilometrdir. Təxminən 200 milyard ulduzu olan Ağ yol qalaktikasının kosmosdakı sürəti isə saatda 950 000 kilometrdir.

Şübhə yoxdur ki, belə qarışıq və sürətli bir sistemdə nəhəng toqquşmaların olması mümkündür. Ancaq belə bir hadisə baş vermir və bu səbəbdən də həyatımızı əmin-amanlıqda davam etdiririk. Çünki kainatdakı hər şey Allah`ın yaratdığı qüsursuz sistemə görə hərəkət edir. Buna görə də ayədə bildirildiyi kimi, bütün bu sistemdə heç bir uyğunsuzluq yoxdur.

## Kainatın Genişlənməsi

Astronomiya elminin hələ inkişaf etmədiyi bir dövrdə - 1400 il əvvəl göndərilən Qurani-kərimdə kainatın genişlənməsindən belə bəhs edilir:

**"Biz göyü qüdrətimizlə yaratdıq və biz onu genişləndirməkdəyik". (Zariyat surəsi, 47)**

Bu ayədəki "səma" (göy) kəlməsindən

Quranın əksər yerində "kainat" və "kosmos" mənasında istifadə edilir. Bu ayə də bildirdiyimiz mənada işlədilir və kainatın genişləndiyini xəbər verir. Azərbaycan dilinə "Biz onu genişləndirməkdəyik" kimi tərcümə edilən ərəb dilindəki "innə lə musiunə" ifadəsindəki "musiunə" kəlməsi "genişləndirmək" mənasına gələn "əvsəə" feilindən törəyib. "Lə" şəkilçisi də birlikdə işlədilən isim və sifətə uyğun olaraq "çox" mənasını ifadə edir. Dolayısilə, bu ifadə "Biz göyü və ya kainatı çox genişləndiririk" mənasına gəlir. Elmin bu gün gəldiyi nəticə Qurandakı qənaətin təkrarlanmasından başqa bir şey deyil. *(S. Waqar Ahmed Husaini, The Quran for Astronomy and Earth Exploration from Space, Goodword Press, 3-cğ nəşr, New Delhi, 1999, ss. 103-108.)*

XX əsrin əvvəllərinə qədər elm dünyasında hakim olan fikir kainatın sonsuz ölçülərə malik olması, sonsuzdan bəri var olduğu və sonsuza qədər də var olacağı şəklində idi. Ancaq müasir texnologiyalar əsasında aparılan tədqiqat və hesablamalar kainatın bir başlanğıcının olduğunu və onun hər an genişləndiyini göstərir.

XX əsrin əvvəllərində rus fiziki Aleksandr Fredman və belçikalı astrofizik Corc Lemaytr kainatın fasiləsiz hərəkət halında olduğunu və genişləndiyini nəzəri olaraq hesablamışdılar. Bu həqiqət 1929-cu ildə müşahidələrlə sübut olunmuşdu.

Amerikalı astronom Edvin Habl (Edwin Hubble) nəhəng teleskopla göy üzünü araşdırarkən ulduzların və qalaktikaların bir-birindən sürətlə uzaqlaşdıqlarını kəşf etdi. Bu kəşf astronomiya tarixinin ən böyük kəşflərindən biri sayılır. Habl bu tədqiqatları zamanı ulduzların uzaqlıqlarına müvafiq olaraq qırmızı rəngə tərəf yaxınlaşan bir işıq yaydığını gördü. Çünki fizikanın məlum qanunlarına görə, müşahidənin aparıldığı nöqtəyə tərəf hərəkət edən işıq qrupu narıncı istiqamətə, müşahidənin aparıldığı nöqtədən uzaqlaşan işıq qrupu da qırmızı tərəfə yayılar. Hablın müşahidələrində isə ulduzların işıqlarında qırmızı istiqamətə tərəf bir yayılma qeyd edilmişdi. Qısası, ulduzlar davamlı olaraq bir-birindən uzaqlaşırdılar. Ulduzlar və qalaktikalar ancaq bizdən deyil, bir-birindən də uzaqlaşırdılar. Hər şeyin fasiləsiz olaraq bir-birindən uzaqlaşdığı bir kainat isə davamlı genişlənən bir kainat mənasına gəlir. Kainatın genişlənməsi sonrakı illərdə də qəti olaraq təsdiq edildi.

Mövzunu daha yaxşı başa düşmək üçün kainatı doldurulmaqda davam edən bir şarın səthi kimi təsəvvür etmək olar. Şarın üstündəki nöqtələr şar dolduqca bir-birindən uzaqlaşdığı kimi, kainatdakı cisimlər də kainat genişləndikcə bir-birindən uzaqlaşır. Əslində, bu həqiqət XX əsrin ən böyük elm adamlarından biri sayılan Albert Eynşteyn tərəfindən də nəzəri olaraq kəşf edilmişdi. Lakin Eynşteyn həmin dövrdə qəbul edilən "statik kainat modeli"nə zidd çıxmamaq məqsədi ilə bu kəşfini bir kənara qoymuşdu. Eynşteyn sonralar bu hərəkətini karyerasının ən böyük səhvi adlandırmışdı. *(http://www.time.com/time/time100/scientist/profile/hubble.html)*



Bu elmi həqiqət hələ heç bir insana məlum olmadığı halda, Quranda əsrlərlə əvvəl açıqlanmışdır. Çünki Quran bütün kainatın yaradanı və hakimi olan Allah`ın sözüdür.

# Allah Hər Şeydən Xəbərdardır:

**ALİ İMRAN, 181:** "Allah kasıbdır, biz isə varlıyıq!"– deyənlərin sözünü Allah eşitdi. Biz onların dediklərini və haqsız olaraq peyğəmbərləri öldürmələrini yazacaq və onlara deyəcəyik: "Dadın yandırıb-yaxan Odun əzabını!

**NİSA, 81:** Onlar: "İtaət edirik!"– deyirlər. Sənin yanından çıxıb getdikdə isə onların bir qismi gecələr bir yerə yığışıb sənin dediyinin əksinə tədbir görürlər. Allah onların gecələr nə tədbir gördüklərini yazır. Onlardan üz döndər və Allaha təvəkkül et! Qoruyan olaraq Allah yetər.

**MAİDƏ, 116:** Allah deyəcəkdir: "Ey Məryəm oğlu İsa! Sənmi insanlara: "Allahı qoyub məni və anamı iki məbud qəbul edin!"– demişdin?" İsa deyəcək: "Sən pak və müqəddəssən! Haqqım olmayan bir şeyi demək mənə yaraşmaz. Əgər bunu demiş olsaydım, əlbəttə, Sən onu bilərdin. Sən mənim qəlbimdə olanları bilirsən, mən isə Sənin Özündə olanları bilmirəm. Şübhəsiz ki, qeybləri bilən Sənsən!

**CASİYƏ, 28:** Sən həmin gün bütün millətləri diz çökmüş görəcəksən. Hər millət öz əməl kitabına tərəf çağırılacaqdır. "Bu gün sizə etdiyiniz əməllərin əvəzi veriləcəkdir!

**CASİYƏ, 29:** Bu Bizim sizin əleyhinizə həqiqəti söyləyən kitabımızdır. Şübhəsiz ki, Biz sizin etdiyiniz əməlləri yazdırmışıq!"

**İSRA, 13:** Biz hər bir insanın əməlini öz boynundan asdıq. Qiyamət günü isə açıq vəziyyətdə qarşısına qoyulan kitabı ona göstərəcəyik.

**İSRA, 14:** Kitabını oxu! Bu gün sənə özün-özünü hesaba çəkməyin yetər.

**HAQQƏ, 19:** Kitabı sağ əlinə verilən deyəcəkdir: "Budur, oxuyun kitabımı!

**HAQQƏ, 20:** Mən bilirdim ki, etdiklərimin hesabına qovuşacağam".

**KƏHF, 49:** Hər kəsin kitabı qarşısına qoyulacaq və sən günahkarların orada yazılmış olanlardan qorxduqlarını görəcəksən. Onlar deyəcəklər: "Vay halımıza! Bu necə bir kitab imiş! O nə bir kiçik, nə də bir böyük günahı buraxmadan hamısını sayıb yazmışdır!" Onlar etdikləri əməlləri öz qarşılarında görəcəklər. Rəbbin heç kəsə haqsızlıq etməz!



**ƏNBİYA, 94:** Kim mömin olduğu halda yaxşı işlər görsə, onun zəhməti inkar olunmaz. Şübhəsiz ki, Biz onun əməllərini yazırıq.

**FURQAN, 22:** Məhz mələkləri görəcəkləri gün günahkarlara heç bir müjdə olmayacaqdır. Mələklər deyəcəklər: "Cənnətə girməyiniz qadağandır, qadağan!"

**FURQAN, 23:** Biz onların etdikləri əməllərə baxdıqdan sonra onları sovrulmuş toz dənəciklərinə çevirərik.

**FUSSİLƏT, 21:** Onlar öz dərilərinə: "Nə üçün əleyhimizə şahidlik edirsiniz?"– deyəcəklər. Dəriləri deyəcək: "Hər şeyi danışdıran Allah bizi danışdırdı. Sizi ilk dəfə O yaratmışdır və siz axırda Ona qaytarılacaqsınız".

**FUSSİLƏT, 22:** Siz qulaqlarınızın, gözlərinizin və dərilərinizin əleyhinizə şahid olmasından çəkinib gizlənmirdiniz. Əksinə, elə zənn edirsiniz ki, Allah sizin etdiyiniz əməllərin çoxunu bilmir.

**ZUXRUF, 80:** Yoxsa onlar elə hesab edirlər ki, Biz onların sirlərini və gizli danışıqlarını eşitmirik? Xeyr! Yanlarında əməllərini yazan elçilərimiz vardır.

**YUNUS, 21:** İnsanlara üz verən bəladan sonra onlara bir mərhəmət daddırdığımız zaman ayələrimizə qarşı hiyləgərlik etməyə çalışarlar. De: "Allah daha tez hiylə qurar". Şübhəsiz ki, elçilərimiz (mələklər) qurduğunuz hiylələri yazırlar.

**YUNUS, 61:** Sən hansı bir işdə olsan, Qurandan nə oxusan, siz nə iş görsəniz, başınız ona qarışarkən Biz sizə şahid olarıq. Nə yerdə, nə də göydə zərrə qədər bir şey Rəbbindən gizli qalmaz. Bundan daha kiçiyi və daha böyüyü yoxdur ki, açıq-aydın Yazıda (Lövhi-Məhfuzda) olmasın.

**HUD, 5:** Baxın, onlar ürəklərini qısırlar (küfrü ört-basdır edirlər) ki, Allahdan gizlənsinlər. Doğrusu, onlar libaslarına büründükdə belə, Allah onların gizli saxladıqlarını da, aşkara çıxartdıqlarını da bilir. Həqiqətən də, O, kökslərdə olanları bilir.

**RƏD, 9:** Allah qeybi və aşkarı Biləndir, Böyükdür, Ucadır.

**RƏD, 10:** Aranızdan sözü gizlədənlər də, onu açıq deyənlər də, gecə gizlənib, gündüz gəzib dolananlar da Allah üçün eynidirlər.

**NƏML, 75:** Göydə və yerdə elə bir gizli şey yoxdur ki, açıq-aydın Yazıda (Lövhi-məhfuzda) olmasın.

**SƏBA, 3:** Kafirlər: "O Saat bizə gəlməyəcəkdir!"– dedilər. De: "Xeyr, qeybi bilən Rəbbimə and olsun ki, o, mütləq sizi haqlayacaqdır. Göylərdə və yerdə zərrə qədər olan bir şey də Ondan gizli qalmaz. Bundan daha kiçik və daha böyük elə bir şey yoxdur ki, açıq-aydın Yazıda (Lövhi-məhfuzda) olmasın".

**QAF, 16:** İnsanı Biz yaratdıq və nəfsinin ona nəyi vəsvəsə etdiyini də bilirik. Biz ona şah damarından da yaxınıq.

**QAF, 17:** Sağında və solunda iki mələk oturub onun əməllərini qeydə alır.

**QAF, 18:** Dediyi elə bir söz yoxdur ki, onu yazmaq üçün yanında hazır durmuş gözətçi olmasın.

**ƏNAM , 59:** Qeybin açarları Onun yanındadır, Onları yalnız O bilir. O, quruda və dənizdə nələr olduğunu bilir. Onun xəbəri olmadan yerə düşən bir yarpaq belə yoxdur. Yerin qaranlıqlarında elə bir toxum, elə bir yaş və elə bir quru şey yoxdur ki, açıq-aydın Yazıda (Lövhi-Məhfuzda) olmasın.

**QAMƏR, 52:** Onların etdiyi hər şey əməllərinin yazıldığı kitablarındadır.

**QAMƏR, 53:** Hər bir kiçik və böyük əməl yazılmışdır.

**HƏDİD, 22:** Yer üzündə baş verən və sizin başınıza gələn elə bir müsibət yoxdur ki, Biz onu yaratmamışdan əvvəl o, Yazıda müəyyən edilmiş olmasın. Şübhəsiz ki, bu, Allah üçün çox asandır.

**MUCADİLƏ, 6:** O gün Allah onların hamısını dirildəcək və etdikləri əməlləri onlara xəbər verəcəkdir. Allah onları hesaba almış, onlar isə etdiklərini unutmuşlar. Allah hər şeyə şahiddir.

**MUCADİLƏ, 7:** Məgər Allahın göylərdə və yerdə olan hər şeyi bildiyini görmürsən? Üç nəfərin arasında gedən elə bir xəlvəti söhbət yoxdur ki, onların dördüncüsü, beş nəfərin də altıncısı O olmasın. İstər bundan az, istərsə də çox olsunlar – harada olursa olsunlar, Allah onların yanındadır. Sonra Qiyamət günü onlara nə etdiklərini xəbər verəcəkdir. Allah hər şeyi bilir.

**TƏHRİM, 3:** Bir zaman Peyğəmbər öz zövcələrindən birinə sirr verdi. O da bunu onun digər zövcəsinə xəbər verdikdə və Allah da bunu Peyğəmbərə aşkar etdikdə o, bunun bir qismini sirr verdiyi zövcəsinə bildirdi, digər qismindən isə vaz keçdi. Peyğəmbər bunu ona

bildirdikdə zövcəsi dedi: “Bunu sənə kim xəbər verdi?” O dedi: “Bunu mənə hər şeyi Bilən, Xəbərdar olan Allah xəbər verdi!”

**MULK, 13:** Sözünüzü gizli saxlasanız da, onu açıq desəniz də, fərqi yoxdur, Allah kökslərdə olanları bilir.

**MULK, 14:** Yaradan Allah Lətif və hər şeydən Xəbərdar olduğu halda, ola bilərmi ki, O, gizlində və aşkarda olanları bilməsin?

**NƏBƏ, 40:** Həqiqətən, Biz sizi yaxın əzab barədə xəbərdar etdik. O gün insan öz əlləri ilə nələr etdiyini görəcək, kafir isə deyəcəkdir: “Kaş mən torpaq olaydım!”

**TƏKVİR, 10:** səhifələr açılacağı zaman,

**İNFİTAR, 10:** Həqiqətən, sizin üstünüzdə nəzarətçilər vardır –

**İNFİTAR, 11:** çox möhtərəm, əməllərinizi yazanlar.

**İNFİTAR, 12:** Onlar sizin nə etdiklərinizi bilirlər.

**ZİLZAL, 6:** O gün insanlar əməllərinin onlara göstərilməsi üçün dəstə-dəstə gələcəklər.

## Allah Bütün Həyatımızı Qeyd Edər və Dirilmə Günü Bizə Göstərər:

**CASİYƏ, 28:** Sən həmin gün bütün millətləri diz çökmüş görəcəksən. Hər millət öz əməl kitabına tərəf çağırılacaqdır. “Bu gün sizə etdiyiniz əməllərin əvəzi veriləcəkdir!

**HƏDİD, 22:** Yer üzündə baş verən və sizin başınıza gələn elə bir müsibət yoxdur ki, Biz onu yaratmamışdan əvvəl o, Yazıda müəyyən edilmiş olmasın. Şübhəsiz ki, bu, Allah üçün çox asandır.



**MUCADİLƏ, 7:** Məgər Allahın göylərdə və yerdə olan hər şeyi bildiyini görmürsən? Üç nəfərin arasında gedən elə bir xəlvəti söhbət yoxdur ki, onların dördüncüsü, beş nəfərin də altıncısı O olmasın. İstər bundan az, istərsə də çox olsunlar – harada olursa olsunlar, Allah onların yanındadır. Sonra Qiyamət günü onlara nə etdiklərini xəbər verəcəkdir. Allah hər şeyi bilir.

**NƏBƏ, 40:** Həqiqətən, Biz sizi yaxın əzab barədə xəbərdar etdik. O gün insan öz əlləri ilə nələr etdiyini görəcək, kafir isə deyəcəkdir: “Kaş mən torpaq olaydım!”



**TƏKVİR, 10:** səhifələr açılacağı zaman,

**İNFİTAR, 10:** Həqiqətən, sizin üstünüzdə nəzarətçilər vardır –

**İNFİTAR, 11:** çox möhtərəm, əməllərinizi yazanlar.

**İNFİTAR, 12:** Onlar sizin nə etdiklərinizi bilirlər.

**ZİLZAL, 6:** O gün insanlar əməllərinin onlara göstərilməsi üçün dəstə-dəstə gələcəklər.

## Quran Qaranlıqlardan Aydınlığa Çıxarır:

**BƏQƏRƏ, 257:** Allah iman gətirənlərin Himayədarıdır, onları zülmətlərdən nura çıxarır. Kafirlərin dostları isə tağutlardır,

onları nurdan zülmətə salarlar. Onlar Od sakinləridirlər və orada əbədi qalacaqlar.



**MAİDƏ, 15:** Ey Kitab əhli! Artıq sizə Kitabdan gizlətdiyiniz şeylərin bir çoxunu bəyan edən və bir çoxunun da üstündən keçən Elçimiz gəlmişdir. Artıq sizə Allahdan bir nur (Muhəmməd) və açıq-aydın bir Kitab gəldi.

**MAİDƏ, 16:** Allah, Onun rizasını arayan şəxsləri bu Kitabla əmin-amanlıq yollarına yönəldir, onları Öz izni ilə zülmətlərdən nura çıxarır və düz yola yönəldir.

**İBRAHİM, 1:** Əlif. Ləm. Ra. Bu, insanları öz Rəbbinin izni ilə qaranlıqdan nura – Qüdrətli, Tərifəlayiq Allahın yoluna çıxartmaq üçün sənə nazil etdiyimiz bir Kitabdır.

**İBRAHİM, 2:** O Allahın ki, göylərdə və yerdə nə varsa, Onundur. Giriftar olacaqları şiddətli əzabdan dolayı vay kafirlərin halına!

**ƏHZAB, 43:** Sizi zülmətlərdən nura çıxartmaq üçün sizə rəhm edən Odur. Onun mələkləri də sizin üçün bağışlanma diləyərlər. Allah möminlərə qarşı Rəhmlidir.

**ŞURA, 52:** Biz sənə Öz əmrimizdən olan ruhu (Quranı) vəhy etdik. Sən kitab nədir, iman nədir bilmirdin. Lakin Biz onu, qullarımızdan istədiyimizi doğru yola yönəltmək üçün, bir nur etdik. Həqiqətən, sən onları doğru yola yönəldirsən –

**HƏDİD, 9:** Sizi zülmətlərdən nura çıxart-maq üçün Öz quluna açıq-aydın ayələri nazil edən Odur. Həqiqətən, Allah sizə Şəfqətlidir, Rəhmlidir.

**TALAQ, 11:** və iman gətirib yaxşı işlər görənləri zülmətlərdən nura çıxartmaq üçün Allahın aydın ayələrini sizə oxuyan bir elçi göndərmişdir. Hər kəs Allaha iman gətirib saleh əməl işləsə, Allah onu içində əbədi qalacağı, ağacları altından çaylar axan Cənnət bağlarına daxil edər. Allah ona gözəl ruzi nəsib etmişdir.

**ƏNAM, 122:** Məgər ölü ikən diriltdiyimiz və özünə də insanlar arasında gəzmək üçün nur verdiyimiz şəxs qaranlıqlar içində qalıb oradan çıxa bilməyən kəs kimi ola bilərmi? Kafirlərə gördükləri işlər beləcə gözəlləşdirildi.

**ƏRAF, 157:** O kəslər ki, yanlarındakı Tövrat və İncildə haqqında yazılmış olduğunu gördükləri elçinin – yazıb-oxumaq bilməyən peyğəmbərin, ardınca gedərlər. O peyğəmbər onlara yaxşı işlər görməyi buyurar, pis əməlləri isə qadağan edər, onlara pak şeyləri halal, murdar şeyləri isə haram edər. Onların ağır yüklərini yüngülləşdirər və onları buxovlardan xilas edər. Ona iman gətirən, onu dəstəkləyən, ona kömək edən və onunla göndərilmiş nurun (Quranın) ardınca gedənlər isə nicat tapanlardır”.

**ƏRAF, 203:** Sən onlara möcüzə gətirmədiyin zaman: “Nə olardı ki, onu da özündən uyduraydın?”– deyərlər. De: “Mən yalnız Rəbbimdən mənə vəhy olunanlara tabe oluram. Bunlar Rəbbinizdən gələn aşkar dəlillər, iman gətirən bir qövm üçün doğru yolu göstərən rəhbər və mərhəmətdir”.

**ZUMƏR, 22:** Məgər Allahın, köksünü İslam üçün açdığı və Rəbbinin nura yönəltdiyi şəxs kafirlə eyni ola bilərmi? Qəlbi Allahın Zikrinə qarşı sərt olanların vay halına! Onlar həqiqətən azğınlıq içindədirlər.

# Quranda İman Həqiqətləri

İslam böyüklərinin "iman həqiqətləri", ya da "həqaiq-i imaniyə" şəklində ifadə etdikləri mövzu, insanları imana yönəldən, Allahın varlığına və birliyinə dəlil olan, onun üstün qüdrət, elm və sənətini gözlər önünə sərən hər cür yaradılış həqiqətini, məlumatı və dəlili əhatə edir. **"İman həqiqəti" anlayışı, "imana aparan, imana vəsilə olan və eyni zamanda imanın artmasını, inkişafını və möhkəmlənməsini təmin edən həqiqətlər"** şəklində də ümumiləşdirilə bilər.



İnsanlar Allahın zatını görə bilməzlər. Ancaq onun varlığını, qüdrət və bəzi sifətlərini, yaratmış olduğu varlıqlara baxaraq anlayarlar. Hər şəkilin öz rəssamını tanıtması kimi, canlı və cansız varlıqlar da özlərini yaratmış olan Allahı bizə tanıdırlar. İnsanın bunlar üzərində düşünməsi və yaradılış dəlillərinə şahid olması lazımdır. Necə ki, Quranda, dəvə, ağcaqanad, arı, hörümçək kimi müxtəlif heyvanları, bitkiləri, ağacları, dağları, yerləri, göyləri bir iman həqiqəti, yəni yaradılış möcüzəsi olaraq nümunə vermişdir. Bu kimi iman həqiqətlərinə diqqət çəkilən ayələrdən bəziləri belədir:

**Məgər onlar dəvənin necə yaradıldığını görmürlər? Göyün necə yüksəldiyini görmürlər? Dağların necə sancıldığını görmürlər? Yerin necə döşədildiyini görmürlər? (Ğaşiyə Surəsi, 17-20)**

**Həqiqətən, ağcaqanadı və (istər böyüklükdə, istərsə də kiçiklikdə) ondan da üstün olanı məsəl çəkməkdən utanmaz. İman gətirənlər bilirlər ki, bu, onların Rəbbindən gələn haqdır. Küfr edənlər isə deyirlər: "Bu məsəllə nə demək istədi?" Halbuki O bununla bir çoxlarını azdırır və bir çoxlarını da haqq yoluna yönəldir. Lakin O, bununla yalnız fasiqləri yoldan çıxarır. (Bəqərə surəsi, 26)**

**Rəbbin bal arısına belə vəhy etdi: "Dağlarda, ağaclarda və insanların düzəltdikləri çardaqlarda özünə pətəklər hör. Sonra bütün meyvələrdən ye və Rəbbinin səndən ötrü asanlaşdırdığı yollarla get". O arıların qarınlarından tərkibində insanlar üçün şəfa olan müxtəlif rəngli bal çıxır. Həqiqətən, bunda düşünən adamlar üçün dəlillər vardır.**

**(Nəhl surəsi, 68-69)**

**Günəşi işıqlı, ayı nurlu edən, illərin sayını və hesabı biləsiniz deyə ona mənzillər (səfhələr) müəyyən edən Odur. bunları yalnız haqq naminə yaratmışdır. O, ayələri bilən adamlara belə izah edir. Doğrudan da, gecə ilə gündüzün bir-birini əvəz etməsində, ın göylərdə və yerdə yaratdıqlarında dan qorxan adamlar üçün dəlillər vardır.**

**(Yunus surəsi, 5-6)**

Ayələrdə vurğulanan bu iman həqiqətləri, mövzuları vicdanlı düşünən hər insan üçün, onu, Allahın varlığını qavramağa və ona yaxınlaşmağa aparan çox əhəmiyyətli səbəblərdir.

## Milçək Qulağındakı Dizayn Eşitmə Alətlərinə Tətbiq Edilmişdir

*Ormia Ochracea* adlı milçək, yumurtalarını cırcıramanın üzərinə buraxar və yumurtalardan çıxan sürfələr cırcırama ilə bəslənərlər. Meşənin içində bir cırcıramanın yerini tapmaq isə olduqca çətindir. Amma Ormia milçəyi, bu iş üçün xüsusi hazırlanmış həssas qulaqları sayəsində, böcəyin yerini

asanlıqla tapa bilər.

İnsan beynində də səsin yerini təsbit etmək üçün eyni üsul istifadə edilir. Bunun üçün, səsin əvvəl yaxınlıqdakı qulağa, daha sonra uzaqda olan qulağa çatması kifayətdir. Səsin iki ayrı qulağa neçə millisaniyə fərqlə çatdığını hesablayan beyin, beləcə səsin gəldiyi istiqaməti təyin edər. İnsanda bu hesablama 10 millisaniyədə nəticələnir. Halbuki, Ormia milçəyi, eyni hesabı iynə başı böyüklüyündəki beyniylə üstəlik insandan 1.000 qat daha sürətli bir şəkildə reallaşdıra bilir.

*(http://www.comdig.de/ComDig01-16/# 14.3)*





Təbiətdəki dizaynlar insan üçün hər zaman tükənməz bir ilham qaynağı olmuşdur. Müasir texnoloji məhsulların böyük hissəsi təbiətdəki dizaynları təqlid edir. Milyonlarla ildir qüsursuz bir şəkildə işləyən sistemləri təqlid etmək, şübhəsiz ki, dizaynerlərin işini olduqca asanlaşdırır. Milçəyin qulağındakı bu mükəmməl dizayn da, indiki vaxtda Ormiafon adı altında, eşitmə aləti və dinləmə cihazlarının istehsalında təqlid edilməyə çalışılır.

İnsanın yalnız köçürə bildiyi bu kimi dizaynlar örnəksiz yaratma gücünün yalnız Allaha aid olduğunu sübut edir.

## "Dənəni Və Çəyirdəyi Yaran Şübhəsiz Allahdır"

**(Ənam Surəsi, 95)**

Hindqozu palma toxumlarını suyla daşıyan bitkilərdəndir. Bu bitkinin toxumları suya qarşı çox dözümlü şəkildə yaradılmışlar. Bu toxumlar suda etdikləri 80 günlük uzun səfərdən sonra quruya çatdıqlarını "anladıqlarında" cücərməyə başlayarlar. Bu, son dərəcə xüsusi bir vəziyyətdir. Çünki bilindiyi kimi bitki toxumları su ilə təmasda olduqları anda cücərməyə başlayarlar. Ancaq hindqozu palması bu mövzuda xüsusidir. Əgər palma toxumları da digərləri kimi suyla təmasda olar olmaz dərhal cücərməyə başlasaydılar soyları çoxdan tükənərdi. Halbuki, bu toxumların cücərməsindəki həssas ölçülərə görə bitki əsrlərdir nəsilini davam etdirmişdir.



Toxumların qabıqlarındakı suya dözümlü strukturları, içlərindəki qidaların miqdarı, quruya çatma vaxtları kimi xüsusiyyətlərindəki hesablamalar heç şübhəsiz ki, öz zəka və qabiliyyətləriylə reallaşmış deyil.

Bütün bu həssas ölçülər, toxumları yaradan, onların ehtiyaclarını bilən, sonsuz ağıl və elm sahibi Allah tərəfindən qüsursuzca nizamlanmışdır. Quranda bu qüsursuz tarazlıq belə bildirilir:

***"Biz yeri döşədik, orada möhkəm dağlar yerləşdirdik və orada hər şeydən lazım olduğu qədər yetişdirdik."***
***(Hicr surəsi, 19)***

## Payız Gəlincə Yarpaqları Tökən Şüurlu Hüceyrələr

Payız yaxınlaşıb günlər qısalmağa başladığında, yarpaq hüceyrələri payızın gəlmək üzrə olduğunu anlayır. Beləcə ilk olaraq yarpağın böyümə hormonu artıma nisbətini salmağa başlayar. Daha sonra, yarpaq sapının budağa bağlandığı nöqtədə yeni hüceyrələr törəyir. Və bu hüceyrələr sanki özlərinə lazım olduğunu bildirmiş kimi bu əlaqə nöqtəsinin üzərində

göbələkdən bir yataq yaradarlar. Bu nöqtəyə "Apsis nöqtəsi" deyilir. Bu göbələkdən yataq, yarpağın budağa olan əlaqəsini olduqca zəiflədir.

Tam bu sırada, yarpaq hüceyrələri bu səfər "etilen" olaraq tanınan yeni bir hormon çıxarmağa başlayarlar. Bu qaz formasındakı hormon yarpağın budağa əlaqəsinin zəiflədilməsi əməliyyatını daha da sürətləndirir. Və artıq yarpaq ən kiçik bir titrəyişdə də budaqdan düşəcək vəziyyətə gəlir.




a) Yarpaq sapı, b) Gələn ilin tumurcuğu, c) Apsis, d) Budaq. Payızın yaxınlaşdığını anlayan ağac budağı. Yarpağı üstündən atmağa hazırlaşır.

Ancaq yarpağın düşməsi ilə hüceyrələrin vəzifəsi tamamlanmır. Bu dəfə hüceyrələr apsis nöqtəsində yarpağın qopmasından meydana gələn yaranın üzərini dərhal bir göbələk təbəqəsi ilə örtərlər və beləcə yaranı müalicə edərlər.

Məhz hər payız yerdə gördüyünüz yarpaqlar burada qısaca izah edilən bir çox biyokimyəvi hadisə nəticəsində tökülürlər.

Bəlkə bu günə qədər varlığını heç düşünmədiyiniz bu ağac hüceyrələri ard-arda reallaşdırdıqları hadisələrlə sanki ağıl və şüur nümayiş edirlər. Bir düşünün:

- *Ağac hüceyrələri payızın gəlmək üzrə olduğunu necə anlayır?*
- *Payızın yaxınlaşdığını anladığında hansı iradə, ağıl və şüurla yarpaqları tökmək üçün hazırlıq görməyə başlayır?*
- *Bu hüceyrələr böyümə hormonu, göbələk, etilen kimi kompleks kimyəvi maddələri çıxarmağı, bunların düsturlarını, təsirlərini, faydalarını haradan bilirlər?*
- *Eyni hüceyrələr ağacın yarası olduğunun necə fərqinə varıb, bu yaranın göbələklə müalicə olacağını necə bilirlər?*
- *Bunların xaricində bu hüceyrələr eyni hormonları niyə yazın və ya yazda deyil də, yalnız payızda çıxarmaqdadırlar? Onlara bu əmri verən, bu yolu göstərən kimdir?*

Şüur, ağıl və məlumat sahibi olmayan atomların birləşib, bu qədər əhatəli və mütəşəkkil bir hadisəni yüz milyonlarla ildir, dünyanın hər küncündə, trilyonlarca ağacda, heç bir zaman axsatmadan və çaşmadan davam etdirmələri qətiliklə qeyri-mümkündür.

Bütün bu ağac hüceyrələrinə etdikləri işləri ilham edən, onlara əmriylə istədiklərini etdirən, əlbəttə ki, sonsuz qüdrət, ağıl və məlumat sahibi olan Rəbbimiz Allahdır. Çünki; ***"O, BİLMƏDƏN BİR YARPAQ BELƏ DÜŞMƏZ. .."*** **(ƏNAM SURƏSİ, 59)**

## Bitkilər Sizdən Daha Şüurludurmu?

Bir insanın önünə bir ovuc mineral və vitamin qarışıq olaraq qoyulsa, bunların içindən lazım olanları seçməsi istənilsə nə qədər müvəffəqiyyətli ola bilər? Ancaq bir insanın müvəffəqiyyətli ola bilmədiyi bu sahədə, bitkilər mükəmməl bir müvəffəqiyyətə sahibdirlər.

Torpağın içində yüzlərlə mineral olar. Bitkilər bu çoxlu saydakı mineral içindən yalnız ehtiyacları olan 13-nü seçib götürərlər. Bu seçim bitkilərdə təzyiq sisteminin tərsinə işləyən nasoslar tərəfindən edilir. Bu nasoslar yalnız minerallları bitki içində paylamaqla kifayətlənmir, eyni zamanda bitki üçün

lazımlı olan maddələri də müəyyən edir və torpaqdan çəkərək bitki içində paylayırlar.



Yaxşı bu şüuru bitki hüceyrələrinə verən nədir?

Yer üzündəki bütün canlılar üçün əhəmiyyətli olan bitkiləri ortaya çıxaran və onlara sahib olduqları xüsusiyyətləri verən Allahdır.

Allah üstün güc sahibi olan, qüsursuzca yaradandır.

Bitkilərin bu xüsusiyyəti yer üzündəki milyonlarla, milyardlarla iman həqiqətindən biridir. İman həqiqətləri imanlı bir müsəlmanın dərinliyini artırır. Həmçinin, bu kimi məlumatlar bir başqa insana izah edildiyində adətən hidayətinə səbəb olur. Bir adamın imanına vəsilə olmaq da əhəmiyyətli bir ibadətdir.

## Balıqlardakı Bənzərsiz Duyğu Sistemi

Yüzlərlə insanın çiyin-çiyinə bir izdiham içində olduğunu düşünün. Hər kəsdən davamlı şəkildə bir sağa bir sola olmaqla təsadüfi hərəkət etməsi istənilsə, üstəlik qaranlıqda heç kimlə toqquşmadan kütləyə uyğun gəlməyiniz mümkün ola bilərmi? Şübhəsiz, xeyr!

Bizim üçün qeyri-mümkün olan bu hərəkət balıqlar üçün çox asandır. Çünki balıqlar "yan xətt" olaraq adlandırılan mükəmməl bir duyğu sistemi ilə yaradılmışlar. Bu sistem bədənin hər iki tərəfində boyuna uzanan nöqtələr və ya kəsik xəttlər halındadır. Sistemin duyğu hüceyrələri dəri altında kanal içərisində yerləşir. Xarici mühitdə ola biləcək ən kiçik bir təzyiq dəyişməsi, su dalğalanması, axıntı şiddəti və istiqaməti bu orqanlarla müəyyən olunur.

Balıqlar bu duyğuların vasitəsi ilə titrəyişləri həm hiss edə və eşidə bilərlər. Yemlərinin yerini və ya düşmənlərinin mövqeyini təyin edə bilərlər, ən bulanıq su axıntılarının içərisində istiqamətlərini tapa bilərlər. Həmçinin, sudakı ən kiçik istilik və təzyiq dəyişikliklərinin də fərqinə vara bilərlər. Yan xətt, xüsusilə, yaxındakı aşağı tezlikli titrəyişlərə qarşı həssasdır, məsələn: sahildəki addımlara və ya suyun səthinə düşən bir cismə... Sahildə danışa bilər, mahnı oxuya bilər və ya radio dinləyə bilərsiniz, ancaq balıqlar bunlardan ürkməyəcəklər. Ancaq suyla əlaqəsi olan bir şeyi hərəkət etdirsəniz, məsələn körpünü yellətsəniz, ya da suya daş atsanız bütün balıqlar oradan qaçacaqlar.




**a) Yan sistem; b) Yan kanal, c) Su giriş-çıxış qapısı, d) Xarici dəri, e) Yan sinir, f) Sinir əlaqəsi, g) Duyğu tükləri, h) Hissiyyat hüceyrələri; i) Sinir.**

Balığın bu duyğu orqanı olduqca kompleks bir quruluşdadır. Təkamül nəzəriyyəsinin iddia etdiyi kimi balığın belə bir mexanizmə ehtiyac duyub, öz iradəsiylə belə bir quruluş ortaya çıxarması qeyri-mümkündür. Belə qüsursuz bir duyğu sisteminin təsadüfi təsadüflərlə, zaman içində mərhələ mərhələ meydana gəlməsi isə mümkün deyil. Buna görə bu sistemin bir dəfədə qüsursuz bir şəkildə Allah tərəfindən yaradıldığı açıqdır.

# Rəbbimiz Bizi Nə Məqsədlə Yaratmışdır?

**ƏRAF, 23:** Hər ikisi: "Ey Rəbbimiz! Biz özümüzə zülm etdik. Əgər bizi bağışlamasan və bizə rəhm etməsən, əlbəttə, ziyana uğrayanlardan olarıq"– dedilər.

**ƏRAF, 24:** Allah dedi: "Bir-birinizə düşmən kəsilərək yerə enin! Yerdə sizin üçün müəyyən vaxta qədər qərar tutacağınız məskən və faydalanmaq üçün istifadə edəcəyiniz şeylər vardır".



**ƏRAF, 25:** Allah dedi: "Siz orada yaşayacaq, orada öləcək və oradan çıxarılacaqsınız"

**BƏQƏRƏ, 35:** Biz dedik: "Ey Adəm! Sən zövcənlə birlikdə Cənnətdə sakin ol və orada rahatlıqla nemətlərimizdən istədiyiniz yerdə yeyin için, təkcə bu ağaca yaxınlaşmayın! Yoxsa zalımlardan olarsınız".

**BƏQƏRƏ, 36:** Şeytan isə o ağacla onları çaşdırıb olduqları yerdən çıxartdı. Biz dedik: "Bir-birinizə düşmən olaraq aşağı enin! Yerdə sizin üçün müəyyən olunmuş vaxtadək məskən və gün-güzəran vardır".

**BƏQƏRƏ, 37:** Adəm tövbə etmək üçün Rəbbindən kəlmələr öyrəndi, O da onun tövbəsini qəbul etdi. Doğrudan da O, tövbələri qəbul edəndir, Rəhmlidir.

**YUNUS, 14:** Sonra onların ardınca sizi yer üzündə xələflər etdik ki, görək necə davranacaqsınız.

**HUD, 7:** Hansınızın daha yaxşı əməl sahibi olduğunu sınamaq üçün, Ərşi su üzərində ikən, göyləri və yeri altı gündə yaradan Odur. Əgər sən: "Siz öləndən sonra diriləcəksiniz!"– desən, kafir olanlar: "Bu, açıq-aydın bir sehrdir!"– deyərlər.

**HUD, 118:** Əgər Rəbbin istəsəydi, insanları vahid bir ümmət edərdi. Amma onlar elə hey ixtilafdadırlar.

**HUD, 119:** Yalnız Rəbbinin rəhm etdiyi şəxslərdən başqa. Allah onları bunun üçün yaratdı. Rəbbinin: "Mən Cəhənnəmi bütün günahkar cinlər və insanlarla dolduracağam!" Sözü yerinə yetəcək.

**KƏHF, 7:** Biz yer üzündə olan bütün şeyləri ona bəzək etdik ki, insanlardan hansının əməlcə daha gözəl olduğunu sınaqdan keçirək.

**ZƏRİYƏT, 56:** Mən cinləri və insanları ancaq Mənə ibadət etmək üçün yaratdım.

**BƏLƏD, 4:** Biz insanı çətinlik içində xəlq etdik.

# Quranı Necə Oxumalıyıq?

**ƏLƏQ 1:** Yaradan Rəbbinin adı ilə oxu!

**NƏHL, 98:** Quran oxuduqda qovulmuş şeytandan Allaha sığın!

**İSRA, 78:** Gün batmağa meyl edəndən gecənin qaranlığınadək bəlli vaxtlarda namaz qıl və sübh çağı Quran oxu (fəcr namazını da qıl)! Çünki sübh çağı oxunan Quranın şahidləri olur.

**TA-HA, 114:** Haqq Hökmdar olan Allah ucadır! Onun ayələrinin vəhyi sənə tamamlanmayınca Quranı oxumağa tələsmə və: "Ey Rəbbim! Elmimi artır!"– de.



**MUMİNUN, 68:** Məgər kafirlər bu Söz haqqında düşünmürlərmi? Yaxud onlara ulu babalarına gəlməyən bir şey gəldi?

**NƏML, 91:** De: “Mənə ancaq bu şəhərin (Məkkənin) Rəbbinə ibadət etmək əmr edilmişdir. O şəhər ki, Rəbbim onu haram buyurmuşdur. Hər şey yalnız Onundur. Mənə əmr olunub ki, müsəlman olum

**NƏML, 92:** və Quran oxuyum!” Kim doğru yolda olsa, yalnız özü üçün doğru yolda olmuş olar. Haqq yoldan azana isə belə de: “Mən ancaq xəbərdar edənlərdənəm!”



**ƏNKƏBUT, 45:** Kitabdan sənə vəhy olunanları oxuyub namaz qıl. Həqiqətən, namaz çirkin və yaramaz işlərdən çəkindirir. Allahı yada salmaq isə ibadətlərin ən əzəmətlisidir. Allah nə etdiklərinizi bilir.

**SAD 29:** Bu mübarək Kitabı, insanların onun ayələrini düşünüb anlaması və ağıl sahiblərinin də ondan ibrət götürməsi üçün sənə nazil etdik.

**MUHƏMMƏD, 24:** Məgər onlar Quran haqqında düşünmürlərmi? Yoxsa qəlbləri qıfıllıdır?

**MUZZƏMMİL, 2:** Az bir hissəsi istisna olmaqla gecələr namaza dur!

**MUZZƏMMİL, 3:** Onun yarısını, yaxud ondan bir az əskilt,

**MUZZƏMMİL, 4:** və ya ona artır. Quranı da aramla oxu!

**MUZZƏMMİL, 5:** Həqiqətən Biz sənə ağır bir Söz (Quran) vəhy edəcəyik.

**MUZZƏMMİL, 6:** Sözsüz ki, gecə qalxmaq çox çətin və Quran oxumaq daha münasibdir.

**QİYAMƏ, 16:** Cəbrail sənə Quranı nazil etdikdə onu tələm-tələsik yadda saxlamaq üçün dilini tərpətmə!

**QİYAMƏ, 17:** Şübhəsiz ki, sənin qəlbində onun qərar tutması və dilinlə onun oxunması Bizə aiddir.

**ƏLA, 6:** Biz sənə Quranı elə oxumaq imkanı verəcəyik ki, o, yadından çıxmayacaq.

**ƏLA, 7:** Əlbəttə, Allahın istədiyindən başqa. Həqiqətən, O, aşkardakından da, gizli qalandan da xəbərdardır.

**ALİ-İMRAN, 113:** Hamısı eyni cür deyillər. Kitab əhli içərisində haqdan möhkəm yapışan bir camaat vardır ki, onlar gecələri səcdəyə qapanıb Allahın ayələrini oxuyurlar.

## Allah İnsanı Necə Yaratdı?

**NƏHL, 4:** Allah insanı nütfədən yaratdı. O isə açıq-aşkar mübahisəçiyə çevrildi.



**KƏHF, 37:** Onunla söhbət edən yoldaşı isə dedi: “Səni torpaqdan, sonra nütfədən yaratmış, daha sonra səni kişi qiyafəsinə salmış Rəbbinə küfrmü edirsən?

**ƏNBİYA, 30:** Məgər kafirlər göylərlə yer bir olduğu zaman Bizim onları bir-birindən araladığımızı, hər bir canlını sudan yaratdığımızı görmürlərmi? Yenədəmi inanmırlar?

**HƏCC, 5:** Ey insanlar! Yenidən

diriləcəyinizə şübhə edirsinizsə, bilin ki, həqiqətən də, Biz sizi torpaqdan, sonra nütfədən, sonra laxtalanmış qandan, daha sonra tam bir şəklə salınmış və ya salınmamış bir parça ətdən yaratdıq ki, qüdrətimizi sizə bəyan edək. Bətnlərdə istədiyimizi müəyyən bir vaxt ərzində saxlayırıq. Sonra sizi oradan uşaq kimi çıxardırıq ki, yetkinlik çağına yetişəsiniz. Sizdən kimisi yetkinlik yaşına çatmamış vəfat edir, kimisi də ömrünün ən rəzalətli dövrünə çatdırılır ki, vaxtilə bildiyi şeyləri unutsun. Sən yer üzünü cansız görürsən. Biz ona yağmur endirdiyimiz zaman o, hərəkətə gəlib qabarır və cürbəcür gözəl bitkilər bitirir.



**MUMİNUN, 12:** Həqiqətən, Biz insanı palçıq cövhərindən yaratdıq.

**MUMİNUN, 13:** Sonra nütfə halında möhkəm yerdə yerləşdirdik.

**MUMİNUN, 14:** Sonra nütfədən laxtalanmış qan yaratdıq, sonra o qandan bir parça ət yaratdıq, sonra o bir parça ətdən sümüklər yaratdıq, sonra da sümükləri ət ilə örtdük. Sonra da onu başqa bir məxluq olaraq xəlq etdik. Yaradanların ən yaxşısı olan Allah nə qədər xeyirxahdır!

**NUR, 45:** Allah hər bir canlını sudan yaratmışdır. Onlardan bəzisi qarnı üstə sürünür, bəzisi iki ayaq üstündə gəzir, bəzisi də dörd ayaq üstündə gəzir. Allah istədiyini yaradır. Şübhəsiz ki, Allah hər şeyə qadirdir.

**FURQAN, 54:** Sudan insan yaradan, ona qan qohumları və sonradan qohum olanları bəxş edən Odur. Rəbbin hər şeyə Qadirdir.

**SƏCDƏ, 7:** Hansı ki, yaratdığı hər şeyi gözəl biçimdə yaratmış, insanı ilk olaraq palçıqdan xəlq etmiş,

**SƏCDƏ, 8:** sonra onun nəslini bir damla dəyərsiz sudan əmələ gətirmiş,

**YA-SİN, 77:** Məgər insan onu nütfədən yaratdığımızı görmür? Budur, o indi açıq-aşkar mübahisə edir.

**NƏCM, 45:** O, insanlardan və heyvanlardan biri erkək və bir də dişi olmaqla iki cüt yaratdı –

**NƏCM, 46:** axıdılan bir nütfədən.

**QİYAMƏ, 36:** Bəlkə insan özbaşına qoyulacağını güman edir?

**QİYAMƏ, 37:** Məgər o, kişi toxumundan axıdılan bir damla nütfə deyildimi?

**QİYAMƏ, 38:** Sonra laxtalanmış qan oldu. Allah onu yaradıb kamil bir görkəmə saldı.

**QİYAMƏ, 39:** Ondan da bir cüt kişi və qadın yaratdı.

**İNSAN, 2:** İnsanı qarışdırılmış nütfədən yaradaraq onu sınaqdan keçirmək məqsədilə eşidən və görən etdik.

**MURSƏLAT, 20:** Məgər Biz sizi dəyərsiz bir sudan (nütfədən) xəlq etmədikmi?

**ƏBƏSƏ, 17:** Qoy ölsün kafir insan! O necə də nankordur!

**ƏBƏSƏ, 18:** Qoy baxıb görsün Allah onu nədən yaradıb?

**ƏBƏSƏ, 19:** Allah onu nütfədən yaratdı və müəyyən şəkildə formalaşdırdı.

**RƏHMAN, 14:** O, insanı saxsı kimi quru gildən yaratdı,

## Allah Nə Üçün Hər Şeydən Ucadır?

**BƏQƏRƏ, 255:** Allah, Ondan başqa ibadətə layiq olan məbud yoxdur, əbədi Yaşayandır, bütün yaratdıqlarının Qəyyumudur. Onu nə mürgü, nə də yuxu tutar. Göylərdə və yerdə nə varsa, Ona məxsusdur. Onun izni olmadan Onun yanında kim havadarlıq edə bilər? O, məxluqatın gələcəyini və keçmişini bilir. Onlar Onun elmindən, Onun istədiyindən

başqa heç bir şey qavraya bilməzlər. Onun Kürsüsü göyləri və yeri əhatə edir. Bunları qoruyub saxlamaq Ona ağır gəlmir. O, Ucadır, Uludur.



**ƏNAM , 46:** De: “Bir deyin görək, əgər Allah sizin eşitmə və görmə qabiliyyətinizi əlinizdən alsa, qəlblərinizə möhür vursa, Allahdan başqa hansı məbud onları sizə qaytara bilər?” Bax gör, Biz ayələri necə izah edirik, sonra onlar yenə üz çevirirlər.

**ƏRAF, 191:** Onlar heç bir şey yaratmayan, özləri xəlq edilmiş olan şeyləri Allaha şərik qoşurlar?

**ƏRAF, 192:** Bütlər nə onlara yardım edə bilər, nə də özlərinə kömək edə bilərlər.

**ƏRAF, 193:** Siz onları doğru yola çağırsanız, sizin ardınızca gəlməzlər. Onları çağırsanız da, sussanız da sizin üçün fərqi yoxdur.

**ƏRAF, 194:** Allahdan savayı çağırdıqlarınız da sizin kimi qullardır. Əgər doğru deyirsinizsə, çağırın onları, sizə cavab versinlər.

**ƏRAF, 195:** Məgər onların ayaqlarımı var, onunla yerisinlər? Yoxsa onların əllərimi var, onunla tutsunlar? Yoxsa onların gözlərimi var, onunla görsünlər? Yoxsa onların qulaqlarımı var, onunla eşitsinlər? De: “Çağırın şəriklərinizi! Sonra mənə qarşı hiylə qurun və mənə heç möhlət də verməyin!



**ƏRAF, 196:** Həqiqətən, mənim himayədarım Kitabı nazil edən Allahdır. O, əməlisalehlərə himayəçilik edir.

**ƏRAF, 197:** Ondan savayı çağırdıqlarınız nə sizə yardım edə bilər, nə də özlərinə köməkçi ola bilərlər”.

**ƏRAF, 198:** Siz onları doğru yola çağırsanız, eşitməzlər. Onları sənə baxan görürsən, halbuki onlar görmürlər.

**YUNUS, 34:** De: “Allaha qoşduğunuz şəriklərdən eləsi varmı ki, hər hansı bir məxluqu ilk dəfə yaratsın, öldükdən sonra onu əvvəlki halına qaytarsın?” De: “Məxluqu ilk dəfə Allah yaradır, öldükdən sonra onu əvvəlki halına qaytarır. Siz necə də haqdan döndərilirsiniz!”

**YUNUS, 35:** De: “Allaha qoşduğunuz şəriklər arasında haqqa yönəldən bir kimsə varmı?” De: “Allah Öz qullarını haqqa yönəldir. Elə isə deyin görək haqqa yönəldən kəs arxasınca gedilməyə daha çox layiqdir, yoxsa özünə doğru yol göstərilməyincə onu tapa bilməyən kəs? Sizə nə olub? Necə mühakimə edirsiniz?”

**İSRA, 42:** De: “Əgər müşriklərin söylədikləri kimi Allahla yanaşı başqa məbudlar olsaydı, onlar Ərş Sahibinin yanına çatmaq üçün yol axtarardılar”.

**İSRA, 43:** Allah müşriklərin söylədiklərindən çox uzaq və çox ucadır.

**HƏCC, 62:** Bu belədir. Çünki Allah Haqdır. Kafirlərin Ondan başqa yalvardıqları isə batildir. Həqiqətən, Allah Ucadır, Böyükdür.

**FURQAN, 61:** Səmada bürclər qoyan və orada günəş və nurlu bir ay yaradan Allah nə qədər xeyirxahdır.

**NƏML, 60:** Göyləri və yeri yaradan, sizin üçün göydən yağmur endirən kimdir? Biz onunla gözəl bağçalar saldıq. Halbuki siz onların ağaclarını böyüdə bilməzdiniz. Heç Allahla yanaşı başqa bir məbudmu var? Xeyr, onlar haqdan yayınan adamlardır.

**NƏML, 61:** Yeri məskən edən, arasından çaylar axıdan, üzərində möhkəm duran

dağlar yaradan və iki dənizin arasında maneə qoyan kimdir? Heç Allahla yanaşı başqa bir məbudmu var? Xeyr, onların əksəriyyəti bunu bilmirlər.

**NƏML, 63:** Qurunun və dənizin qaranlıqlarında sizə doğru yol göstərən, külələri Öz mərhəməti önündə yağışdan qabaq müjdəçi kimi göndərən kimdir? Heç Allahla yanaşı başqa bir məbudmu var? Allah onların qoşduqları şəriklərdən ucadır.

**QASAS, 71:** De: “Bir deyin görək, əgər Allah gecəni üstünüzdə Qiyamətə qədər uzatsa, Allahdan başqa hansı məbud sizə bir işıq gətirə bilər? Məgər siz eşitmirsiniz?”

**QASAS, 72:** De: “Bir deyin görək, əgər Allah gündüzü üstünüzdə qiyamətə qədər uzatsa, Allahdan başqa hansı məbud dincəldiyiniz gecəni sizə gətirə bilər? Məgər siz görmürsünüz?”

**RUM, 40:** Sizi yaradan, sonra sizə ruzi verən, sonra sizi öldürən, sonra da sizi diriltdəcək məhz Allahdır. Şərikləriniz içərisində bunlardan, heç olmazsa, birini edə bilən varmı? O, pakdır və müşriklərin Ona şərik qoşduqlarından ucadır.

**FATİR, 3:** Ey insanlar! Allahın sizə verdiyi lütfünü bir xatırlayın. Allahdan başqa sizə göylərdən və yerdən ruzi verən bir xaliq varmı? Ondan başqa heç bir məbud yoxdur. Siz necə də haqdan döndərilirsiniz!

**FATİR, 40:** De: “Allahdan başqa yalvardığınız şəriklər haqda düşündünüzmü? Bir mənə göstərin görüm, onlar yer üzündə nəyi yaradıblar? Yoxsa onların göylərin yaradılmasında şərikliyi var?” Yaxud onlara bir kitab vermişik, onlar da ondakı dəlilə istinad edirlər? Xeyr! Zalımlar bir-birinə ancaq yalan vəd verirlər.

**FATİR, 41:** Həqiqətən, Allah göyləri və yeri tərpənməsinlər deyə, tutub saxlayır. Əgər tərpənsələr, Ondan başqa onları heç kəs tutub saxlaya bilməz. Həqiqətən də, O, Həlimdir, Bağışlayandır.

**YA-SİN, 36:** Yerin bitirdiklərindən, insanların özlərindən və bilmədiklərindən bütün cütləri yaradan Allah pakdır, müqəddəsdir.

**YA-SİN, 82:** Bir şeyi yaratmaq istədikdə ona təkcə: “Ol!” deyər, o da olar.

**YA-SİN, 83:** Əlində hər şeyin hökmü Olan Allah pak və müqəddəsdir. Siz ancaq Onun hüzuruna qaytarılacaqsınız.

**MUMİN, 64:** Sizin üçün yeri məskən, göyü də tavan edən, sizə surət verib surətlərinizi gözəl şəklə salan, sizə pak nemətlərdən ruzi verən Allahdır. Budur sizin Rəbbiniz olan Allah. Aləmlərin Rəbbi olan Allah nə qədər xeyirxahdır!

**HƏŞR, 23:** O, Özündən başqa heç bir məbud olmayan, Hökmran, Müqəddəs, Pak, haqqı təsdiq edən, hər şeyi müşahidə edən, Qüdrətli, Qadir, Məğrur Allahdır. Allah onların Ona şərik qoşduqlarından ucadır.

## Doğru Yol Nə Deməkdir?

**BƏQƏRƏ, 120:** Sən onların dininə tabe olmayınca, nə yəhudilər, nə də xaçpərəstlər səndən razı qalmayacaqlar. De: “Yalnız Allahın haqq yolu doğru yoldur!” Əgər sənə gələn elmdən sonra onların istəklərinə uysan, səni Allahdan nə bir qoruyan, nə də bir xilas edən olar.



**ALİ -İMRAN, 51:** Həqiqətən, Allah mənim də Rəbbim, sizin də Rəbbinizdir. Ona ibadət edin! Çünki bu, düz yoldur”.

**MƏRYƏM, 36:** İsa dedi: “Həqiqətən, Allah həm mənim Rəbbim, həm də sizin Rəbbinizdir. Elə isə yalnız Ona ibadət edin! Düz yol da budur”.

**YA-SİN, 60:** Ey Adəm övladları! Məgər Mən sizə buyurmadımmı ki, şeytana ibadət etməyin, o sizin açıq-aydın

düşməninizdir,

**YA-SİN, 61:** Mənə ibadət edin? Doğru yol budur!

**FUSSİLƏT, 30:** Həqiqətən də: "Rəbbimiz Allahdır!"– deyib sonra düz yol tutan kəslərə mələklər nazil olub deyirlər: "Qorxmayın və kədərlənməyin! Sizə vəd olunan Cənnətlə sevinin!

**ZUXRUF, 61:**Həqiqətən, İsanın yer üzünə enməsi Saatın yaxınlaşmasının əlamətidir. Qiyamətə şəkk etməyin və Mənə tabe olun. Budur, düz yol!

**ZUXRUF, 64:** Həqiqətən, Allah mənim də Rəbbim, sizin də Rəbbinizdir. Elə isə Ona ibadət edin! Budur düz yol!"

## Yer Üzünü Hansı Məqsədlə Yaratmışdır?

**HUD, 7:** Hansınızın daha yaxşı əməl sahibi olduğunu sınamaq üçün, Ərşi su üzərində ikən, göyləri və yeri altı gündə yaradan Odur. Əgər sən: "Siz öləndən sonra diriləcəksiniz!"– desən, kafir olanlar: "Bu, açıq-aydın bir sehrdir!"– deyərlər.

**KƏHF, 7:** Biz yer üzündə olan bütün şeyləri ona bəzək etdik ki, insanlardan hansının əməlcə daha gözəl olduğunu sınaqdan keçirək.



**ƏNBİYA, 16:** Biz göyü, yeri və onların arasında olanları əyləncə üçün yaratmamışıq.

**SAD, 27:** Biz göyü, yeri və onların arasındakılarını nahaq yerə xəlq etməmişik. Bu, kafirlərin zənnidir. Vay o kafirlərin Oddakı halına!

**CASİYƏ, 22:** Allah göyləri və yeri ədalətlə yaratmışdır ki, hər kəs qazandığının əvəzini alsın. Belə ki, onlara heç bir haqsızlıq edilməyəcəkdir.

**ƏHQAF, 3:** Biz göyləri, yeri və onların arasında olanları ancaq bir həqiqət kimi və məlum bir zaman kəsimi üçün yaratdıq. Kafirlər isə xəbərdar edildikləri şeylərdən üz döndərdilər.

## Allah Nə Üçün Təriflənir?

**ƏNAM , 1:** Göyləri və yeri yaradan, zülmətləri və nuru var edən Allaha həmd olsun! Bu dəlillərdən sonra kafir olanlar hələ də bütləri öz Rəbbinə tay tuturlar.

**İBRAHİM, 1:** Əlif. Ləm. Ra. Bu, insanları öz Rəbbinin izni ilə qaranlıqdan nura – Qüdrətli, Tərifəlayiq Allahın yoluna çıxartmaq üçün sənə nazil etdiyimiz bir Kitabdır.



**İBRAHİM, 2:** O Allahın ki, göylərdə və yerdə nə varsa, Onundur. Giriftar olacaqları şiddətli əzabdan dolayı vay kafirlərin halına!

**MUMTƏHƏNƏ , 6:** Onlarda sizin üçün – Allaha və Axirət gününə ümid bəsləyənlər üçün gözəl nümunə vardır. Kim üz döndərsə bilsin ki, Allah Zəngindir, Tərifəlayiqdir.

# Dinimizi Öyrənək

*Əziz uşaqlar, sizə çox əhəmiyyətli mövzular barədə danışmaq istəyirik. Amma həqiqətən də üzərində düşünməyinizi və anlamağınızı istədiyimiz çox əhəmiyyətli mövzular...*



Hamınız məktəbdə əvvəlcə oxuyub-yazmağı, sonra da rəqəmləri və riyaziyyatı öyrənirsiniz. Bəs sizə; "məktəbə niyə gedirsiniz və bunları niyə öyrənirsiniz" sualını versək, nə deyərsiniz?

Əlbəttə ki, əksəriyyətiniz; "böyüdükdə peşə sahibi olmaq istədiyim üçün məktəbə gedirəm və bunları öyrənirəm" deyərsiniz. Hamınız bir gün böyüyəcəyinizdən əminsiniz. Əslində, bu çox doğru fikirdir. Həqiqətən də siz indi necə ki, böyüklərinizə xala, əmi, baba deyirsinizsə, bir gün sizə də xala, əmi, baba deyə səslənəcəklər. Yəni siz də bir gün böyüyəcəksiniz.

Əlbəttə ki, insanlar müəyyən yaşa qədər böyüyüb, sonra daim o yaşda qalmazlar. Hər insan yavaş-yavaş yaşlanar və vaxtı gəldikdə bu dünyadan ayrılaraq axirətdəki həyatını yaşamağa başlayar. Bütün bunları siz də yaşayacaqsınız. Siz də uşaqlar aləmindən gənclər aləminə, gənclər aləmindən isə xalalar və əmilər aləminə keçəcəksiniz və bir gün nənələrinizin, babalarınızın yaşına çatacaqsınız. Əlbəttə ki, ən sonda axirətdəki həyatınıza başlayacaqsınız.

Yaxşı, indi bir düşünün! Böyüyəcəyiniz zamanlar üçün məktəbə gedirsiniz və yeni məlumatlar öyrənirsiniz. Doğrudur bunlar çox gözəl şeylərdir. Lakin, bu edəcəkləriniz yalnız dünya həyatınız üçün lazımdır. Bəs axirət həyatınız üçün nələr etməlisiniz? Onun üçün də hazırlıq görməlisiniz, bunu heç düşünmüşdünüzmü?

Böyüdüyünüz zaman rahat yaşamaq üçün peşə sahibi olmaq, peşə sahibi olmaq üçün də məktəbə getmək məcburiyyətindəsiniz. Eynilə axirətdə xoşbəxt həyat yaşamaq üçün də müəyyən şeylər etməlisiniz. İlk növbədə elə bu dəqiqə sizi və bütün insanları



yaradan Uca Allahı tanımağa və Rəbbimiz olan Allahın nələr etməyinizi və necə davranmağınızı istədiyini öyrənməyə başlamalısınız.

Sizə, sizi, ananızı, atanızı, dostlarınızı, bütün insanları, bütün heyvanları, bütün canlıları, dünyanı, Günəşi, Ayı, bütün kainatı

yaradan Allahın gücünü izah edəcəyik. Onun böyüklüyündən, sonsuz elmindən, etməyimizi və etməməyimizi istədiyi şeylərdən danışacağıq. Unutmayın ki, bu məlumatlar sizin üçün çox əhəmiyyətlidir və sizə çox şey qazandıracaq!

## Allah Hamımızın Yaradıcısıdır

İnsanların danışarkən içində Allah sözü olan cümlələr işlətdiyini eşidirsiniz. Bunlar ümumiyyətlə; "Allah qorusun", "Allah nəsib eləsə", "İnşaAllah", "Allah bağışlasın", "Allah qəbul etsin" kimi cümlələrdir.

Bu sözlər Allah anıldığı zaman istifadə edilən dua mahiyyətli və ya Allahı ucaldan ifadələrdir. Məsələn, "Allah qorusun" ifadəsi, Allahın sizin və ətrafınızda gördüyünüz canlı-cansız bütün varlıqların üzərində sonsuz güc sahib olduğu mənasını verər. Sizi, ata və ananızı, dostlarınızı pis şeylərdən Allah qoruyar. Bundan ötrü də, bu söz xüsusilə sel və ya bunun kimi arzuolunmaz bir hadisədən bəhs edildikdə tez-tez işlədilər. Bir düşünün, sizcə ananız, atanız və ya sel barədə məlumat sahibi hər hansı bir böyüyünüz



seli dayandıra bilərmi? Əlbəttə ki, dayandıra bilməz. Çünki insanın qarşısına belə bir hadisəni çıxardan da, onu dayandırmağa gücü çatan da yalnız Allahdır.



"İnşaAllah" sözü də dilimizdə; "əgər Allah istəsə" mənasını verir. Buna görə də, gələcəyə dair bir istəyimizi və ya niyyətimizi dilə gətirmək istədikdə, mütləq "inşaAllah" deyərik. Çünki gələcəyi ancaq Allah bilər və hər şeyi istədiyi kimi yaradar. Allah istəmədiyi müddətcə heç nə olmaz.

Məsələn, bir dostunuz; "sabah mütləq məktəbə gedəcəyəm" dediyi vaxt səhvliyə yol verər. Çünki Allahın, gələcəkdə onun nələr etməsini istədiyini bilmərik. Bəlkə də, sabah xəstə olub məktəbə gedə bilməyəcək və ya hava pisləşəcəyi üçün məktəblərdə tətil başlayacaq.

Buna görə də gələcəyə dair bir niyyətimizi dilə gətirərkən, "inşaAllah" deməklə Allahın hər şeyi bildiyini, hər şeyin ancaq O istədikdən sonra olacağını, Onun bizə bildirdiyindən başqa heç bir şey bilmədiyimizi əsaslı şəkildə söyləmiş olarıq. Beləliklə də, sonsuz güc və elm sahibi Rəbbimiz olan

Allaha qarşı lazım olan hörmətli rəftarı göstərmiş olarıq.

Allah bizə Quran ayələrində belə söyləməli olduğumuzu bildirir. Bunu bizə xəbər verən ayə belədir:

Heç bir şey barəsində: "Mən onu sabah mütləq edəcəyəm!" demə! Ancaq: "Əgər Allah istəsə!" ("inşallah" de!) Unutduğun zaman Rəbbini yada salıb: "Ola bilsin ki, Rəbbim məni bundan daha yaxın müvəffəqiyyətə nail etsin" de.

(Kəhf surəsi, 23-24)

Belə əhəmiyyətli mövzular barədə indiyə qədər elə də çox şey öyrənməmiş ola bilərsiniz, ancaq bu əhəmiyyətli deyil. Çünki, Allahı tanımaq üçün başqalarının sizə nəsə söyləməsinə ehtiyac yoxdur. Bunun üçün ətrafınıza baxmağınız və bir qədər düşünməyiniz kifayətdir.



Hər yer Allahı və Onun sonsuz gücünü tanıdan gözəlliklərlə doludur. Sevimli ağ dovşanı, delfinlərin gülər üzlərini, kəpənəklərin qanadlarındakı möhtəşəm rəngləri və ya masmavi dənizi, yamyaşıl meşələri, rəngarəng çiçəkləri və bunlar kimi saymaqla bitməyəcək bir çox gözəlliyi düşünün. Məhz bütün bunları yaradan Allahdır. Gördüyünüz bütün kainatı, dünyanı, canlıları Allah yoxdan yaratmışdır. Bundan ötrü də, yaratdığı bu gözəlliklərə baxaraq, Allahın Ucalığını görə bilərsiniz.

Əlbəttə ki, hər şeydən əvvəl öz varlığımız Allahın varlığının dəlilidir. O zaman əvvəlcə özümüz və Allahın bizi necə mükəmməl şəkildə yaratdığı barədə düşünək.

## İnsanın Yaradılışı

Bir insanın necə yarandığını heç düşündünüzmü? Bu suala cavab olaraq; "hər insanın ata və anası var" deyə bilərsiniz. Amma bu qaneedici cavab olmaz. Çünki bu cavab, ilk ata-ananın, yəni ilk insanların necə yaranmış olduğunu izah etmir. Sizə, bu mövzu ilə əlaqədar məktəbdə və ya ətrafınızda bəlkə bəzi şeylər deyilmiş ola bilər. Amma bütün bu deyilənlər içində doğru olan yeganə cavab, insanı Allahın yaratmış olmasıdır. Bir qədər sonra daha ətraflı şəkildə öyrənəcəyik, amma indi ümumi şəkildə bir şeyi bilməlisiniz; ilk insan həzrəti Adəmdir. Allah digər bütün insanları onun nəslindən meydana gətirmişdir.

Hz. Adəm də eynilə bizim kimi yeriyən, danışan, Allaha dua edən, ibadət edən bir insan idi. Allah, ilk insan olaraq onu və sonra da həyat yoldaşını yaratdı. Beləliklə onların uşaqları bütün dünyaya yayıldılar.

Bunu qətiyyən unutmayın: Allah yaratmaq üçün yalnız əmr verər. Bir şeyin olması üçün təkcə ona "ol" deməsi kifayətdir. Bunun üçün heç nəyə ehtiyacı yoxdur. Məsələn, Allah, hz. Adəmi palçıqdan yaratmışdır. Allah üçün hər şey çox asandır.

Ancaq unutmayın ki, dünyada Allahın varlığını inkar edən insanlar da var. Bu insanlar, insanın necə yarandığı sualına başqa cavablar axtarmağa çalışmışdırlar. Bunların məqsədi haqqı, həqiqəti axtarmaq deyil. Qətiyyən təəccüblənməyin, amma bu cür insanların məqsədi, yalnız və yalnız Allahın varlığını qəbul etməmək və Onun əmrlərini yerinə yetirməməkdir. Ancaq bu cür insanların hər şeyi Allahın yaratdığını qəbul etməməsi həqiqəti dəyişdirməz. Onlar nə qədər rədd etsə də, hər şeyi olduğu kimi, bu insanları da Allah yaratmışdır.

Bilirsinizmi bu nəyə bənzəyir, bunu bir nümunə ilə izah edək:

Bir cizgi film qəhrəmanı düşünün. Çox bacarıqlıdır, qüvvətlidir və bir çox çətin işi də yerinə yetirə bilsin. İndi bu cizgi film qəhrəmanı, cizgi filmi əsnasında sizə belə desə:

"Mən öz-özümə yarandım. Məni heç kəs çəkmədi. Məni meydana gətirən cizgilər onsuz da əzəldən bəri vardı. Bədənimin forması, rənglərim, gözlərim, qollarım, görməyim, danışmağım, hər şeyim mənə aiddir. Öz-özünə yarandılar. Onları bir rəssam çəkmədi və boyamadı. Mənə hərəkət qabiliyyətini heç kəs vermədi. Seyr etdiyiniz bütün xüsusiyyətlərimi planlaşdıran, dizayn edən, onlara forma verən və onları nizamlayan heç kəs yoxdur".



Görəsən bu cizgi film qəhrəmanının sizə bunları söyləməsi başınızı qarışdırarmı? Söylədiklərinin doğru ola biləcəyini heç düşünərsinizmi? Əlbəttə ki, xeyr. O qəhrəmana sual verə bilsəniz və o da sizə cavab verə bilsə, ona belə sual verərsinizmi?:

"Sən belə deyirsən, lakin buna baxmayaraq, sənin cizgilərini çəkən bir rəssam var. Sən özün necə çəkildiyini, rəngləndiyini və hərəkət etdiyini düşünürsən?"

Çizgi qəhrəmanı da sizə belə cavab versə: "Məni meydana gətirən cizgilər mürəkkəbin kağıza tökülməsi nəticəsində təsadüfən əmələ gəldi. Boyalar da eynilə təsadüfən töküldü və rəngləndirdi. Yəni mənim yaranmağım üçün məni çəkən, mənə forma verən birinə ehtiyacım yoxdur, təsadüfən yarana bilərəm" desə, yəqin ki, bu deyilənlərə inanmazsınız. Belə mükəmməl cizgilərin, rənglərin, hərəkətlərin, boyaların tökülməsi

nəticəsində təsadüfən ortaya çıxa bilməyəcəyini bilirsiniz. Çünki butulka aşdıqda yalnız mürəkkəb və boya ləkəsi əmələ gələr. Gözəl, düzgün cızıqlardan ibarət bir şəkil əmələ gəlməz. Mənalı, aktual, işə yarayan şeylərin əmələ gələ bilməsi üçün, biri onu, düşünərək dizayn etməli və çəkməlidir. Bütün bunları anlamağınız üçün, o cizgi film qəhrəmanını çəkəni və rəngləyəni görməyinizə ehtiyac yoxdur. Bu qəhrəmanın xüsusiyyətlərinin, formasının, rənglərinin, danışma qabiliyyətinin, yerimə, tullanma qabiliyyətlərinin cizgi filmi dizayn edən insan tərəfindən ona verildiyini anlayarsınız.



Məhz bu verdiyimiz nümunədən sonra bunu çox yaxşı düşünün: Özünü Allahın yaratdığını qəbul etməyən insan da, eynilə bu nümunədəki cizgi film qəhrəmanı kimi yalançı mövqeyinə düşər. İndi belə bir insanın bizimlə danışdığını düşünək. Bu insanın, bütün insanların və özünün yaradılışını necə izah etməyə çalışdığına bir baxın:

"Mənim anam, atam, onun atası və xeyli qədim vaxtlarda ilk ata-ana, yəni ilk insanlar tamamilə təsadüfən yaranmışdır. Bizim formamızı, gözümüzü, qulağımızı, bütün orqanlarımızı daim təsadüflər əmələ gətirmişdir".

Özünü Allahın yaratdığını inkar edən bu insanın söylədikləri, cizgi film qəhrəmanın söylədiklərinə necə də bənzəyir. Aradakı yeganə fərq, qəhrəmanın kağız üzərindəki cizgilərdən və boyalardan, bunu söyləyənin isə, hüceyrələrdən meydana gəlmiş canlı bir insan olmasıdır. Bəs bunun nə fərqi var? Bunu söyləyən canlı insan, cizgilərdən meydana gələn həmin film qəhrəmanından, daha mükəmməl və daha çox orqana sahib, çox mürəkkəb bir maşın kimi deyildirmi? Yəni cizgi film qəhrəmanının təsadüfən əmələ gəlməsi qeyri-mümkündürsə, bu insanın təsadüfən meydana gəlməsi bundan qat-qat qeyri-mümkündür. İndi bu insana belə sual verək:

"Sənin çox gözəl və işəyararlı bir bədənin var. Əllərin, əşyaları ən mükəmməl maşınlardan belə daha həssas tutur, ayaqlarınla qaça bilirsən. Gözlərin ən keyfiyyətli kameralardan belə daha aydın görür. Qulaqların ən təkmilləşmiş maqnitofonlardan belə daha az xışıltılı eşidir və bunun kimi daha bir çox orqanın, xəbərin belə olmadan səni həyatda saxlayır. Yaşamağına səbəb olur. Məsələn, ürəyinin, böyrəklərinin, qaraciyərinin fəaliyyətinə sən nəzarət etmirsən. Amma onlar ən mükəmməl fabriklərdən belə daha mükəmməl işləyirlər. Bütün bu orqanların bənzərlərini fabriklərdə əmələ

gətirmək üçün, yüzlərlə elm adamı, mühəndis işləyir, plan və layihələr qururlar. Yenə də orqanların eynisini əmələ gətirə bilmirlər. Yəni sən çox mükəmməl bir canlısan. Bəs indi bütün bunları necə izah edəcəksən?". Bunları Allahın yaratdığını qəbul etməyən o insan bəlkə də belə söyləyəcək: "Mən də, mükəmməl bir bədənə və orqanlara sahib olduğumu bilirəm. Amma mən, cansız və şüursuz atomların tamamilə təsadüflər nəticəsində birləşərək hüceyrələrimizi, orqanlarımızı və bizi əmələ gətirdiyinə inanıram".





Artıq, yəqin ki, bu insanın ağılsız və gülünc şeylər söylədiyini gördünüz. Bu cür iddialar ortaya atan bir insanın, yaşından və peşəsindən asılı olmayaraq, doğru düşünmədiyi və yanlış şeylər iddia etdiyi aydındır. Nə qədər təəccüb oyandırsa da, ətrafınızda belə qeyri-mümkün və axmaq şeylərə inanan insanlara rast gələ bilərsiniz.

Ən sadə maşının belə dizayneri olduğu halda, əlbəttə ki, insan kimi mükəmməl bir varlıq, öz-özünə və təsadüfən yarana bilməz. Şübhəsiz ki, ilk insanı yaradan Allahdır və digər insanların yaranması üçün ilk insanın bədənində lazımi sistemləri yaradan da Allahdır. Allah bütün canlıların nəsillərinin davam etməsini hüceyrələrinə yerləşdirdiyi proqramdan asılı hala gətirmişdir. Biz də Allahın yaratdığı bu proqram əsasında yarandıq və bu proqramda yazılanlar əsasında böyüməyə davam edirik. Bu mövzuyla əlaqədar indi oxuyacaqlarınız hamımızın Yaradıcısı olan Allahın sonsuz güc və elm sahibi olduğunu bir qədər də yaxşı anlamağınızı təmin edəcək.

## İnsan Bədənindəki Mükəmməl Proqram

Əvvəlki başlıqda Allahın insan bədəninə yerləşdirdiyi mükəmməl bir proqramdan bəhs etdik. Məhz bu proqram sayəsində bütün insanlar gözlərə, qulaqlara, qollara, dişlərə sahib olar. Bu proqram sayəsində xarici görünüşlərində bəzi fərqlər yaransa da, bütün insanlar bir-birinə bənzəyər. Yenə bu proqram sayəsində qohumlarımıza bənzəyərik, eləcə də, hər ölkə xalqının özünəməxsus xüsusiyyətləri olar. Məsələn,



çinlilər və yaponlar adətən bir-birlərinə bənzəyərlər. Zəncilərin öz irqlərinə məxsus dəri rəngləri, üz, ağız, göz quruluşları var.

**İndi isə bu proqramın necə bir şey olduğunu belə bir nümunə ilə izah edək:**

Hamınız kompyuterlərin necə işlədiyini az-çox bilirsiniz. Bu mövzunu yaxşı bilən bir mütəxəssis, kompyuteri dizayn edər. Kompyuterin bu dizayn əsasında istehsalı üçün zəruri olan mikroprosessor, monitor, klaviatura, disk, kolonka kimi hissələr də xüsusi fabriklərdə yüksək texnologiya əsasında yenə bu mövzuda məlumat sahibi insanlar tərəfindən istehsal olunar. Artıq, ortada çox mürəkkəb əməliyyatlar apara bilən bir maşın var. Onunla oyun oynaya bilər və ya yazı yaza bilərsiniz. Lakin kompyuterin bu işləri görə bilməsi üçün, "proqram" adlanan proqramlara ehtiyacı var. Yəni içinə yerləşdirdiyiniz oyun disklərindəki məlumatlar kimi. Bunun üçün mütəxəssislər tərəfindən xüsusi olaraq hazırlanmış proqramlar olmasa kompyuteriniz işə yaramayacaq.



Üstəlik, bildiyiniz kimi, istənilən proqram istənilən markalı kompyuterdə işləməz. Deməli, proqramı yazan şəxs, eyni zamanda kompyuter barəsində də məlumat sahibi olmalı və ona uyğun bir proqram hazırlamalıdır. Bir kompyuterin işləməsi üçün nə qədər çox şey bilmək lazımdır elə deyilmi? Həm bir maşına, həm də onu işlədəcək müvafiq proqrama ehtiyacınız var. Ancaq ən əhəmiyyətlisi bütün bunları dizayn edən və istehsal edən insanlar olmasa kompyuteriniz yenə işləməz.

**Məhz, insan bədəni də bir kompyuter kimidir, bir qədər əvvəl də söylədiyimiz kimi, bədənimizi təşkil edən hüceyrələrin içinə bizim mövcud olmağımızı təmin edən bir proqram yüklənmişdir. İndi bunu düşünün: İlk insanın içinə qoyulan bu proqram necə meydana gəlmiş ola bilər? Cavab aydındır: Hər insan xüsusi olaraq yaradılmışdır və bunu təmin edən proqramı da yüksək məlumat və çox üstün güc sahibi Allah meydana gətirmişdir. Bədənimizi də, onu formalaşdıran proqramı da Allah yaratmışdır.**

Ancaq bunu yanlış anlamayın; əslində insan bədənini bir kompyuterlə müqayisə etmək qeyri - mümkündür. Çünki bədənimiz ən təkmilləşmiş kompyuterdən belə olduqca mükəmməl quruluşa malikdir. Belə ki, yalnız beynimiz belə istənilən cəhətdən kompyuterdən qat-qat üstündür.

Gəlin indi də, bir insanın necə

yarandığını daha doğrusu sizin dünyaya necə gəldiyinizi birlikdə araşdıraq:

Ananızın bətnində əvvəlcə kiçik bir ət parçası olar. Bu parça getdikcə böyüyər və müəyyən formaya düşər. Vaxt keçdikcə sümükləriniz, əzələləriniz, başınız, gözünüz, qulağınız tam öz yerlərində yaranmağa başlayar. Heç bir orqanınızın yeri dəyişik düşməz.

Boyunuzun nə qədər olacağı, göz rənginiz, əzələniz, əlinizin forması və digər yüzlərlə xüsusiyyətiniz ilk andan etibarən bəllidir. Məhz bütün bu məlumatlar Allahın hüceyrələrimizi ilk dəfə yaradarkən içinə qoyduğu proqramda yazılmışdır. Allah hər şeyi ən incə nöqtəsinə qədər müəyyənləşdirib bu proqrama yazmışdır ki, bu da bütün insanların hüceyrələrinin içinə yerləşdirilmişdir. Bu sayədə insan nəsli davam edər. Bu proqram elə mükəmməl və müfəssəldir ki, necə işlədiyini belə elm adamları hələ təzə-təzə anlamağa başlamışdırlar.



Allahın bədənimizə yerləşdirdiyi bu proqrama uyğun olaraq illər boyu yavaş-yavaş böyüyərik. Bundan ötrü də, bədənimizin böyüməsi bizə qəribə gəlməz. Doğulub böyüməyimiz onlarla il davam edər. Bu proqramın çox sürətli işləyəcəyi təqdirdə, nə qədər təəccüblənəcəyimizi bir düşünün. Yeni doğulmuş bir körpə gözlərimizin qarşısında, birdən-birə, bir neçə saat ərzində yaşlı bir insana çevrilsə heyrət içində qalardıq.

## Uzun Ayaqlı Leyləklər

Leyləklər, 1-1,5 m boylarında, böyük ağ qanadları olan iri, köçəri quşlardır. Dimdiklərinin və uzun ayaqlarının qırmızı olması leyləklərə xoş bir gözəllik bəxş edir. Leyləklər hər il sıx sürülər halında köç edirlər. Çünki soyuq ərazilərdə yaşaya bilməzlər. Leyləklər bizi yayın isti günləriylə müjdələyir. Havaların nə vaxt isinəcəyini bilmələri bir möcüzədir. Aradan bir il keçib təkrar yaz gəldikdə leyləklər minlərlə kilometr yolu geri qayıdıb köhnə yuvalarını taparlar. Əlbəttə ki, bu cür güclü bir yaddaş və belə möhtəşəm bir istiqamət tapma duyğusunu leyləklərə Rəbbimiz olan Allah ilham edir.





*"O kəslər ki, sənə göndərilənə (Qurana) və SƏNDƏN ƏVVƏL GÖNDƏRİLƏNLƏRƏ iman gətirir, axirətə də şəksiz-şübhəsiz inanırlar." (Bəqərə surəsi, 4)*

# TÖVRATDAN:

## Allah İman Gətirənləri Sevər və Onlara Rəhm Edər

Amma **Məni sevib əmrlərimə əməl edənlərin isə minlərlə nəslinə məhəbbət göstərərəm**. (Çıxış 20:6; Qanunun Təkrarı,5:10)

... "Rəbb Mənəm, rəhmli və lütfkar Rəbb Allaham. **Mən hədsiz səbirli, bol məhəbbətli və sədaqətliyəm, minlərlə nəslinə məhəbbətimi göstərərəm, cəzanı, qanunsuzluğu və günahı bağışlayaram**..." (Çıxış, 34: 6-7)



Kərənay çalanlar və ilahiçilər bir səslə Rəbbə həmd və şükür etməklə səslərini birgə ucaltdılar. Kərənayların, sinclərin, musiqi alətlərinin səsi yüksələndə onlar dedi: **"Rəbbə həmd edin, çünki yaxşıdır, çünki məhəbbəti əbədidir"** (İkinci Salnamələr, 5:13)

**"Rəbbin məhəbbətinə görə məhv olmadıq, Çünki mərhəməti tükənməzdir. Hər səhər bunlar təzələnir**, Sənin sədaqətin böyükdür" (Mərsiyələr, 3:22-23)

Onlar Rəbbə həmd və şükür edib növbə ilə Onu tərənnüm edərək belə deyirdilər: **"Rəbb yaxşıdır, çünki İsrailin üzərində məhəbbəti əbədidir".** (Ezra, 3:11)

**Qəm-qüssə versə belə, Bol məhəbbətinə görə rəhmə gələr**. (Mərsiyələr, 3:32)

Ya Rəbb, **salehə xeyir-dua verirsən, Lütfünlə sipər kimi onları hifz edirsən.** (Zəbur, 5:12)

Ya Rəbb, gəl, mənə kömək et, **Məhəbbətin naminə məni xilas et!** (Zəbur, 6:4)

Rəbb uzaqdan mənə görünüb dedi: "Səni əbədi bir məhəbbətlə sevdim, Buna görə də sevgi ilə Səni Özümə təref çəkdim." (Yeremya, 31:3)

**Sənin məhəbbətinə güvənirəm**, Qurtuluşunla qəlbim şadlanacaq. Rəbbə ilahi nəğməmi oxuyacağam, Çünki mənə comərdlik etdi. (Zəbur, 13:5-6)

Qoy Rəbbə alqış olsun! Çünki mühasirəyə düşən şəhərdə **Məhəbbətini xariqələrlə mənə göstərdi!...** Rəbbi sevin, siz ey bütün möminlər! Rəbb həmişə Ona sadiq qalanı qoruyur, Təkəbbürlü insana isə layiq olduğunu verir. (Zəbur, 31:21-23)

Rəbb salehliyi və ədaləti sevir, Yer üzü Onun məhəbbəti ilə dolur. (Zəbur, 33:)

Ya Rəbb, məhəbbətin göylərdədir, Sədaqətin asimanı bürüyür. Dağlar kimi salehliyin uludur, Dərya kimi ədalətin dərindir. Ya Rəbb, həm insanı, həm heyvanı qoruyursan. Ey Allah, məhəbbətin nə qədər qiymətlidir! Bəşər



***"O kəslər ki, sənə göndərilənə (Qurana) və SƏNDƏN ƏVVƏL GÖNDƏRİLƏNLƏRƏ iman gətirir, axirətə də şəksiz-şübhəsiz inanırlar." (Bəqərə surəsi, 4)***

övladları Sənin qanadlarının kölgəsinə sığınır. Evinin bolluğu ilə onları doydurursan, Sənin xoşhal edən axar çayından onları içirirsən. Çünki həyat mənbəyi Səndədir, Biz Sənin nurunla görə bilirik. (Zəbur, 36:5-9)

**Məhəbbətin böyükdür, göylərə çatır**, Sədaqətin buludlara dəyir. Ey Allah, göylər üzərində ucal! Ehtişamın bütün yer üzərində olsun! (Zəbur, 57:10-11)

Alqış olsun Allaha! Duamı rədd etmədi, **Məndən məhəbbətini əsirgəmədi!** (Zəbur, 66:20)

**Çünki Sən, ey Xudavənd, xeyirxahsan, bağışlayan Sənsən, Səni səsləyənlərin hamısı üçün məhəbbətin boldur**. Çünki mənə olan məhəbbətin böyükdür, Canımı ölülər diyarına enməkdən qurtardın. (Zəbur, 86:5, 13)



Ey Xudavənd, Sən rəhmli, lütfkar Allahsan, Hədsiz səbirlisən, məhəbbətin və sədaqətin boldur. (Zəbur, 86:15)

Ey bütün millətlər, Rəbbə həmd edin! Ey bütün ümmətlər, Onu mədh edin! **Bizə olan məhəbbəti böyükdür**, Rəbbin sədaqəti əbədidir! Rəbbə həmd edin! (Zəbur, 117:1-2)

Mən "ayağım büdrəyir" deyən zaman, **Ya Rəbb, mənə məhəbbətinlə dayaqsan.** (Zəbur, 94:18)

Rəbb rəhmli və lütfkardır, Hədsiz səbirli və bol məhəbbətlidir. Çünki göylər yerdən nə qədər ucadırsa, Ondan qorxanlara olan məhəbbəti o qədər böyükdür... Ata övladlarına rəhm etdiyi kimi Rəbb də Ondan qorxanlara elə rəhm edir... Rəbbin isə Ondan qorxanlara olan məhəbbəti, Onların övladlarına olan salehliyi Əzəldən var, bu əbədi qalacaq. Onun əhdinə vəfa edənlərə bunları göstərir, Qayda-qanunlarını yerinə yetirənləri unutmur. (Zəbur, 103:8, 11, 17-18)

Rəbbə şükür edin, ona görə ki yaxşıdır, Çünki **məhəbbəti əbədidir**!... **Rəbbə şükür etsinlər** məhəbbətinə görə, Bəşər övladlarına göstərdiyi xariqələrinə görə!... Kimin ağlı varsa, qoy buna fikir versin, Qoy **Rəbbin məhəbbətini dərk etsin**! (Zəbur, 107:1, 21, 43)

Rəbbə şükür edin, ona görə ki yaxşıdır, Çünki məhəbbəti əbədidir! (Zəbur, 118:29)

Ey İsrail, Rəbbə ümidini bağla! **Çünki Rəbdə məhəbbət var, Onda bol-bol qurtuluş var**. (Zəbur, 130:7)

Məni sağ əlinlə qurtarırsan. Rəbb mənə verdiyi vədə əməl edir. **Ya Rəbb, məhəbbətin əbədidir**. Öz əlinin işini tərk etmə! (Zəbur, 138:7-8)

Paltarlarınızı deyil, ürəyinizi yırtın,



*"O kəslər ki, sənə göndərilənə (Qurana) və SƏNDƏN ƏVVƏL GÖNDƏRİLƏNLƏRƏ iman gətirir, axirətə də şəksiz-şübhəsiz inanırlar." (Bəqərə surəsi, 4)*

Allahınız Rəbbə tərəf qayıdın. Çünki O, lütfkar və rəhmlidir, Hədsiz səbirlidir, **bol məhəbbətlidir**, Bəla göndərməz, rəhm edər. (Yoel, 2:13)

**Məni sevənləri sevirəm**, Məni səylə axtaran tapır. (Süleymanın Məsəlləri, 8:17)

Ya Rəbb, əzəldən bəri var olan Mərhəmətini, **məhəbbətini yada sal**. ...**Rəbb yolunda onun üçün xeyirxahlıq və sədaqət var**. (Zəbur, 25:6, 10)

Qoy Rəbbə alqış olsun! Çünki mühasirəyə düşən şəhərdə Məhəbbətini xariqələrlə mənə göstərdi! (Zəbur, 31:21)

Amma mən Allahın evində Yaşıl zeytun ağacına bənzərəm, **Daima, əbədilik Allahın məhəbbətinə güvənirəm**. Sənin gördüyün işlərə görə daim şükür edirəm, Möminlərin qarşısında gözəl isminə ümid bağlayıram! (Zəbur, 52:8-9)

Allah-Taalanı çağırıram, Mənim üçün hər şeyi verən Allahı çağırıram. 3Göydən mənə qurtuluş göndərəcək, Başımı yemək istəyəni rüsvay edəcək. Sela Allah Öz **məhəbbətini və sədaqətini göndərəcək**. (Zəbur, 57:2-3)

Ya Rəbb, daim məhəbbətindən nəğmə oxuyacağam, Sənin sədaqətini dilim hər nəslə deyəcək. Deyirəm ki, məhəbbətin əbədiyaşardır, Sədaqətin göylər qədər sarsılmazdır. (Zəbur, 89:1-2)

**Səhər-səhər bizə doyunca məhəbbət göstər**, Qoy ömrümüz boyu sevinib fərəhlənək. (Zəbur, 90:14)

Dərgahına şükürlərlə, Həyətlərinə həmdlərlə gəlin. Ona şükür edin, İsminə alqış söyləyin. **Rəbb nə yaxşıdır, məhəbbəti əbədidir**, Sədaqəti nəsillərdən-nəslə çatır! (Zəbur, 100:4-5)

Məhəbbətini, həqiqətini tərənnüm edəcəyəm, **Ya Rəbb, Sənə ilahi söyləyəcəyəm!** (Zəbur, 101:1)

Bütün İsrail övladları odun düşdüyünü və məbədin üzərində olan Rəbbin izzətini görəndə daş döşəmənin üstündə üzüstə yerə çöküb **"Rəbbə şükür olsun, çünki O yaxşıdır, Onun məhəbbəti əbədidir"** deyərək səcdə etdilər. (İkinci Salnamələr, 7:3)

Kahinlər öz vəzifələrinə görə dayandı, Levililər isə Rəbbin musiqi alətləri ilə durdu. Padşah Davud bunları düzəltmişdi ki, o, **"Rəbbə şükür olsun, çünki məhəbbəti əbədidir"** oxuyaraq həmd edəndə Levililər onlarda çalsın. Kahinlər onların qarşısında kərənaylar çalırdı və bütün İsraillilər ayaq üstə dayanmışdı. (İkinci Salnamələr, 7:6)

Rəbbə şükür edin, ona görə ki yaxşıdır, Çünki məhəbbəti əbədidir! Qoy İsraillilər belə desin: **"Çünki məhəbbəti əbədidir!"** Harun nəsli belə desin: **"Çünki məhəbbəti əbədidir!"** Qoy Rəbdən qorxanlar belə söyləsin: **"Çünki məhəbbəti əbədidir!"...** Allahım Sənsən, Sənə şükür edəcəyəm! Allahımsan, Səni yüksəldəcəyəm! (Zəbur, 118:1-4, 28)

**Əlavə olaraq baxa bilərsiniz:**

**Yoel, 2:13**
**Mərsiyələr, 3:25**



*“O kəslər ki, sənə göndərilənə (Qurana) və SƏNDƏN ƏVVƏL GÖNDƏRİLƏNLƏRƏ iman gətirir, axirətə də şəksiz-şübhəsiz inanırlar.” (Bəqərə surəsi, 4)*

# İNCİLDƏN:

## İncildə Allah Sevgisi və Allah Rizasına Uyğun Sevgi Anlayışı

Bir din alimi yaxınlaşıb ona, “Bütün buyruqların ən əhəmiyyətlisi hansıdır?” deyə soruşdu. İsa belə cavab verdi: “Ən əhəmiyyətlisi budur: **“Dinlə, ey İsrail! Allahımız olan Rəbb tək Rəbdir. Allahın olan Rəbbi bütün ürəyinlə, bütün canınla, bütün ağlınla və bütün gücünlə sev. İnsanın Allahı bütün qəlbiylə, bütün zehniylə və bütün gücüylə sevməsi, qonşusunu da özü kimi sevməsi, bütün yandırılan nəzirlərdən və təqdim edilən qurbanlardan daha əhəmiyyətlidir”.** (Mark, 12:28-33)

Adam belə cavab verdi: **“Allahın olan Rəbbi bütün qəlbinlə, bütün canınla, bütün gücünlə və bütün ağlınla sev. Qonşunu da özün kimi sev”.** (Luka, 10:27)

İsa belə cavab verdi: “Ən əhəmiyyətlisi budur: “Dinlə, ey İsrail! Allahımız Rəbb tək Rəbdir. **Allahın Rəbbi bütün qəlbinlə, bütün canınla, bütün ağlınla və bütün gücünlə sevəcəksən”. İkincisi də budur: “Qonşunu özün kimi sevəcəksən”... “** (Mark, 12:29-31)

**Sevgi Allahın buyruqlarına uyğun yaşamağımız deməkdir.** Başlanğıcdan bəri eşitdiyiniz kimi, Onun buyruğu sevgi yolunda yürümənizdir. (2 Yəhya, 1:6)

... **Allahın olan Rəbbi bütün ürəyinlə, bütün canınla, bütün anlayışınla sevəcəksən.** Məhz ilk və ən əhəmiyyətli buyruq budur. İlkinə bənzəyən ikinci buyruq da budur: **“Qonşunu özün kimi sevəcəksən”.** (Matta, 22:37-39)

**Hər şeydən əvvəl bir-birinizi səmimi qəlbdən sevin. Çünki sevgi bir çox pisliyi örtər.** (1 Peter, 4:8)

**Bir-birinizə qardaşlıq sevgisiylə bağlı olun.** Bir-birinizə hörmət göstərməkdə yarışın. (Romalılara, 12:10)

**Sevimli bacı-qardaşlarım, bir-birimizi sevək. Çünki sevgi Allahdandır. Sevən hər kəs... Allahı tanıyar.** Sevməyən insan Allahı tanımaz. Çünki Allah sevgidir... Sevimli bacı-qardaşlarım, Allah bizi bu qədər çox sevdiyinə görə biz də bir-birimizi sevməyə borcluyuq. (1 Yəhya, 4:7-11)



Duam budur ki, **sevginiz, bilgi və hər növ duyğuyla artdıqca artsın.** (Filipililərə, 1:9)



*"O kəslər ki, sənə göndərilənə (Qurana) və SƏNDƏN ƏVVƏL GÖNDƏRİLƏNLƏRƏ iman gətirir, axirətə də şəksiz-şübhəsiz inanırlar." (Bəqərə surəsi, 4)*

[Hz. İsa (ə.s):] Sizə [Allah rizası üçün] yeni bir buyruq verirəm: **"Bir-birinizi sevin. Sizi sevdiyim kimi siz də bir-birinizi sevin.** Bir-birinizə sevginiz olsa, hər kəs bununla mənim şagirdlərim olduğunuzu anlayacaq". (Yəhya, 13:34-35)

**Sevgi səbirlidir, sevgi şəfqətlidir. Sevgi qısqanmaz, öyünməz, lovğalanmaz. Sevgi kobud davranmaz, öz mənfəətini axtarmaz, asanlıqla qəzəblənməz, pisliyin hesabını tutmaz. Sevgi haqsızlığa sevinməz, həqiqi olanla sevinər. Sevgi hər şeyə qatlanar, hər şeyə inanar, hər şeyə ümid edər, hər şeyə dözər. Sevgi [Allahın sevgisi] əsla sona çatmaz...** (1 Korinflilərə, 13:4-8)

**Amma Allahı sevəni Allah bilər.** (1 Korinflilərə, 8:3)

**Əgər sadəcə sizi sevənləri sevsəniz, nə mükafatınız olar?** Vergiyığanlar da belə etmirmi? Sadəcə qardaşlarınıza salam versəniz, artıq nə etmiş olarsınız?... (Matta, 5:46-47)

"Qonşunu sevəcəksən, düşməninə nifrət edəcəksən" deyildiyini eşitdiniz. **Amma mən sizə deyirəm ki, "düşmənlərinizi sevin, sizə zülm edənlər üçün dua edin".** (Matta, 5:43-44)

**Məsih bizi necə sevdisə... Siz də eləcə sevgi yolu ilə gedin.** (Efeslilərə, 5:2)

Məni sevirsinizsə, [Allah rizası üçün] buyruqlarımı yerinə yetirərsiniz... Kim [Allah rizası üçün] buyruqlarımı bilir və yerinə yetirsə, məni sevən odur. **Məni sevəni Allah sevəcək. Mən də onu sevəcəyəm...** (Yəhya, 14:15, 21)

İsa ona bu qarşılığı verdi: **"Məni sevən sözümə əməl edər, Allah da onu sevər...** Məni sevməyən, sözlərimə qulaq asmaz. Eşitdiyiniz söz mənim deyil; məni göndərən Allahındır". (Yəhya, 14:23-24)

Sizə bu buyruğu verirəm: **"Bir-birinizi sevin!"** (Yəhya, 15:17)

Yazıldığı kimi, "Allahın Onu sevənlər üçün [axirət həyatında] hazırladıqlarını heç bir göz görmədi, heç bir qulaq eşitmədi, heç bir insan ürəyi qavramadı". (1 Korinflilərə, 2:9)

... **"Qonşunu özün kimi sevəcəksən".** (Qalatiyalılara, 5:14)

**[Hz. İsa (ə.s):] "Allahın məni sevdiyi kimi, mən də sizi sevdim. Mənim sevgimdə qalın.** Əgər [Allah rizası üçün] buyruqlarımı yerinə yetirsəniz, sevgimdə qalarsınız, eynilə mənim də Allahın buyruqlarını yerinə yetirdiyim və sevgisində qaldığım kimi... Bunları sizə, sevincim sizdə olsun və sevinciniz tamamlansın deyə söylədim. Mənim buyruğum budur: **Sizi sevdiyim kimi bir-birinizi sevin. Heç kimdə, insanın [Allah rizası üçün] dostları uğrunda canını verməsindən daha böyük bir sevgi yoxdur.** Sizə [Allah üçün] buyurduqlarımı etsəniz, mənim dostlarım olarsınız". (Yəhya, 15:9-14)

... **Bir-birimizi sevsək... [Allah] sevgisi içimizdə mükəmməlləşmiş olar.** (1 Yəhya, 4:12)

Ümid xəyal qırıqlığına uğratmaz. Çünki...



***"O kəslər ki, sənə göndərilənə (Qurana) və SƏNDƏN ƏVVƏL GÖNDƏRİLƏNLƏRƏ iman gətirir, axirətə də şəksiz-şübhəsiz inanırlar." (Bəqərə surəsi, 4)***

**Allahın sevgisi ürəklərimizə dolmuşdur.** (Romalılara, 5:5)

**Allahın bizə olan sevgisini bildik və buna inandıq. Allah sevgidir. Sevgidə yaşayan Allahda [Allahın rizasına uyğun] yaşayar...** (1 Yəhya, 4:16)

**Elə isə, Allahın müqəddəs və sevimli seçilmişləri olaraq ürəkdən mehribanlığa, yaxşılığa, təvazökarlığa, səbirə, mülayimliyə bürünün.** Bir-birinizə anlayışlı davranın. Birinizin o birindən bir şikayəti varsa, Rəbbin sizi bağışladığı kimi, siz də bir-birinizi bağışlayın. **Hər şeydən əvvəl... sevgiyə bürünün.** (Kolosselilərə, 3:12-14)

Bizsə sevirik, çünki əvvəl O [Allah] bizi sevdi. "Allahı sevirəm" deyib, qardaşından nifrət edən yalançıdır. Çünki gördüyü qardaşını sevməyən, görmədiyi Allahı sevə bilməz. **"Allahı sevən qardaşını da sevsin" deyən buyruğu Məsihdən aldıq.** (1 Yəhya, 4:19-21)

Daimi olan üç şey vardır: İman, ümid, sevgi... (1 Korinflilərə, 13:13)

İnsanların və mələklərin diliylə danışsam, amma sevgim olmasa, səs çıxaran misdən ya da çalınan zəngdən fərqim qalmaz... Bütün sirləri bilsəm, hər bilgiyə sahib olsam, amma sevgim olmasa, bir heçəm. Varımı, yoxumu sədəqə olaraq paylasam, bədənimi yandırılmağa təslim etsəm, amma sevgim olmasa, bunun mənə heç bir faydası olmaz. (1 Korinflilərə, 13:1-3)

İsa... "Həyata qovuşmaq istəyirsənsə, Onun [Allahın] buyruqlarını yerinə yetir". "Hansı buyruqları?" deyə soruşdu adam. İsa bu qarşılığı verdi: "Adam öldürməyəcəksən, zina etməyəcəksən, oğurlamayacaqsan, yalan yerə şahidlik etməyəcəksən, ata-anana hörmət edəcəksən" və **"qonşunu özün kimi sevəcəksən."** (Matta, 19:17-19)

Allahı sevə bilməz. **"Allahı sevən qardaşını da sevsin" deyən buyruğu Məsihdən aldıq.** (1 Yəhya, 4:19-21)



Daimi olan üç şey vardır: İman, ümid, sevgi... (1 Korinflilərə, 13:13)

## Əlavə olaraq baxa bilərsiniz:

**1 Korinflilərə,** 13:1-3; **Matta,** 19:17-19; **1 Timoteyə,** 4:12; **1 Salonikililərə,** 5:12-13; **2 Salonikililərə,** 1:3-4; **Luka,** 6:32; **Luka,** 11:42; **Romalılara,** 8:35; **Romalılara,** 8:38-39; **1 Korinflilərə,** 8:1; **Romalılara,** 13:8; **1 Peter,** 1:22; **1 Peter,** 2:17; **1 Peter,** 3:8; **1 Yəhya,** 3:11; **1 Yəhya,** 3:18; **1 Yəhya,** 3:23; **Mark,** 10:21; **1 Yəhya,** 5:3; **Yəhya,** 14:31; **Yəhya,** 16:27; **Romalılara,** 13:9-10; **Efeslilərə,** 1:15-16; **Efeslilərə,** 6:24; **Kolosselilərə,** 1:3-4; **1 Salonikililərə,** 4:9-10; **Yaqub,** 2:8; **1 Peter,** 1:8; **2 Yəhya,** 1:5; **İbranilərə,** 13:1-3; **1 Salonikililərə,** 3:12; **1 Yəhya,** 3:10; **1 Yəhya,** 2:10-11; **2 Timoteyə,** 1:7; **Filimona,** 1:16; **Luka,** 6:27-28; **Romalılara,** 12:9.




# 2 AYƏDƏ BAŞQA 1 AYƏNİN BİRLƏŞMƏSİ:

**ZUMƏR, 62:**
**Allah hər şeyin xaliqidir. O, hər şeyə vəkildir!**

**1) RƏD, 16:**
“De: “Göylərin və yerin Rəbbi kimdir?” De: “Allahdır!” De: “Belə olduqda, Onu qoyub özlərinə nə bir xeyir, nə də bir zərər verə bilənlərimi özünüzə dost (hami) edirsiniz?!” De: “Heç korla görən və ya zülmətlə nur eyni ola bilərmi?! Yoxsa onlar Allaha Onun yaratdığı kimi yaradan şəriklər qərar verdilər və onların nəzərincə bu yaratma bir-birinə bənzər göründü?!” De: “**Allah hər şeyin xaliqidir.** O birdir, qəhr edəndir!”

**2) ƏNAM, 102:**
O Allah Rəbbinizdir! Ondan başqa heç bir tanrı yoxdur. Hər şeyi yaradan Odur. Buna görə də yalnız Ona ibadət edin. **O, hər şeyə vəkildir!**

**ƏNFAL, 53:**
**Bu əzab ona görədir ki, bir tayfa özünə bəxş edilən nemәti dəyişməyincə, Allah da ona əta etdiyi neməti dəyişən deyildir. Həqiqətən, Allah eşidəndir, biləndir!**

**1) RƏD, 11:**
Onu öndən və arxadan təqib edənlər vardır. Onu Allahın əmri ilə qoruyurlar. **Hər hansı bir tayfa öz tövrünü dəyişmədikcə, Allah da onun tövrünü dəyişməz.** Əgər Allah hər hansı bir qövmə bir pislik yetirmək istəsə, onun qarşısı heç cür alına bilməz və Ondan başqa onların heç bir hamisi də olmaz.

**2) ƏRAF, 200:**
Əgər sənə Şeytandan bir vəsvəsə gəlsə, Allaha sığın. **Şübhəsiz ki, Allah eşidəndir, biləndir!**

***"Bu (Quran), aləmlər üçün ancaq bir öyüddür! Siz onun verdiyi xəbəri bir müddət sonra mütləq biləcəksiniz." (Sad surəsi 87-88)***



# 3 AYƏDƏ BAŞQA 1 AYƏNİN BİRLƏŞMƏSİ:

**HƏDİD, 2:**
**Göylərin və yerin hökmü Onun əlindədir.**
**Dirildən də, öldürən də Odur.**
**O, hər şeyə qadirdir!**

**1) <u>BURUC, 9:</u>**
O Allah ki, **<u>göylərin və yerin ixtiyarı Onun əlindədir.</u>** Allah hər şeyə şahiddir!

**2) <u>DUXAN, 8:</u>**
Ondan başqa heç bir tanrı yoxdur. **<u>O həm dirildir, həm də öldürür.</u>** O həm sizin Rəbbiniz, həm də ulu babalarınızın Rəbbidir.

**3) <u>TƏĞABUN, 1:</u>**
Göylərdə və yerdə nə varsa, Allahı təqdis edib şəninə təriflər deyər. Hökm Onundur, həmd-səna da Ona məxsusdur. **<u>O, hər şeyə qadirdir!</u>**

**TƏĞABUN, 10:**
**Kafir olub ayələrimizi yalan sayanlara gəldikdə isə, onlar cəhənnəmlikdirlər.**
**Onlar orada həmişəlik qalacaqlar.**
**Ora necə də pis məskəndir!**

**1) <u>BƏQƏRƏ, 39:</u>**
**<u>Kafir olaraq ayələrimizi təkzib edənlər isə cəhənnəmlikdirlər,</u>** onlar orada (atəş içində) əbədi qalacaqlar.

**2) <u>LOĞMAN, 9:</u>**
**<u>Onlar orada əbədi qalacaqlar.</u>** Allahın (möminlərə verdiyi cənnət) vədi haqdır. O, yenilməz qüvvət, hikmət sahibidir!

**3) <u>MULK, 6:</u>**
Rəbbini inkar edənləri cəhənnəm əzabı gözləyir. **<u>Ora necə də pis məskəndir!</u>**

# HAQQI YILMAZIN ARAŞDIRMALARINA ƏSASƏN QURANDAKI BƏZİ SÖZLƏRİN MƏNALARI

**Rəbb** - Rəbb "tərbiyə edib yetişdirən, yaratdıqlarını müəyyən bir proqrama uyğun olaraq, müəyyən hədəflərə çatdıran, inkişafı planlayaraq idarə edən" mənasına gəlir. Bu söz mütləq mənada ancaq Allah üçün işlədilir. İnsanlar üçün "evin rəbbi", "iş yerinin rəbbi" şəklində istifadə edilir. Bu ifadəyə ən yaxın söz türk dilinə fransız dilindən daxil olan "patron" sözüdür. Bu söz, yaxın mənanı versə də, sadəcə ticarət sahəsinə aid olan bir ifadə olduğundan, "rəbb" sözünün mənasını eynilə vermir. Ona görə də, "rəbb" sözünü bir-iki sözlə ifadə etmək imkanı olmadığından, məalımızda bu sözü ərəbcədəki kimi saxlamaq məcburiyyətində qaldıq. Buna görə də, oxucularımız, yuxarıdakı tərifi yaxşı yadda saxlamalıdır.

**Oxu** – Öyrən-öyrət.
Bu əmr şəxsən Peyğəmbərə verilmişdir, başqalarına aidiyyəti yoxdur. Bizim "öyrən-öyrət" şəklində tərcümə etdiyimiz "iqra" sözü məal və təfsirlərdə çox halda "oxu" şəklində tərcümə edilir. Burada tələb olunan şey, bir kitab və yaxud bir yazının oxunması deyil. Belə bir oxuma işini insan öz-özlüyündə də yerinə yetirə bilər. Sözün əsl mənası, "yığ, yığdıqlarını da payla" deməkdir. Beləliklər, bununla nəzərdə tutulan şey "öyrənib-öyrətmək"dir. Bu, peyğəmbərlik vəzifəsinin əsl mahiyyətidir. Elçinin nəyi öyrənib-öyrətməli olduğu daha sonra (8/87, Əla / 1-13; Nəcm: 20) ona bildiriləcək. Buna görə biz bu sözü "öyrən-öyrət" şəklində tərcümə etdik.

**Səlat** - Maddi və yaxud zehni baxımdan dəstək olmaq; cəmiyyəti maarifləndirməyə çalışmaq.
"Səlat" sözü əsrlərdən bəri əsl mənası xaricində "namaz" olaraq dərk edilmiş və o cür tərcümə edilmişdir. "Səlat" sözünün həqiqi mənası "dəstək olmaq, kömək etmək, problemlərin altına öz çiynini vermək, problemlərin həllini öz üzərinə götürmək, arxa olmaq"dır. Quranda "əs-səlat" sözü "problemlərə maddi və zehni baxımdan dəstək olmaq, problemlərin həlli üçün öz çiynini yükün altına vermək" mənasında xüsusi isim olmuşdur. Buradakı problemlər sadəcə fərdi problemlər deyil, eyni zamanda iqtisadi və siyasi problemlər, təhsil və təlim-tərbiyə problemləri kimi ictimai problemləri də əhatə etməkdədir. Qısacası, səlat sosial dövlətin əsası və simvoludur. Bizim mealımızda, xüsusi isim olan "əs-səlat" sözünün həm əsli, həm də tərcüməsi verilmişdir. Səlatın tərcüməsi haqqında daha ətraflı məlumat "Təbyinül-Quran"dadır.
Quranda səlat saxlamaqla [iqamə etməklə] bağlı əmr və xəbər cümlələri, ümumiyyətlə belə tərcümə edilmişdir: "namazı düzgün qılın, namazı lazımınca qılın". Sözlərin mənalarına görə apardığımız təhlil isə göstərir ki, bu tərcümələr əslində cümlənin mənasını tam əks etdirmir, hətta yanlış əks etdirir. İqam sözü "oturmaq" felinin əks mənalısı olan qıyam sözünün ef'al babında məsdər formasıdır. Lüğətlərdə sözün bu formasının mənası belə göstərilmişdir: "ayağa qaldırmaq, ayaq üstünə qoymaq, ayaq üstündə saxlamaq".
Bu mənalar nəzərə alındıqda, iqamis-səlat tamamlamasının mənası belə olmalıdır: "zehni və maddi yardım və dəstəklə problemlərin həll edilməsi işlərini yerinə yetirmək və bu işləri davam etdirmək, yəni bu işləri ayaq üstündə saxlamaq, bu işləri yerinə yetirmək məqsədiylə təşkilatlanmaq". Daha da konkretləşdirmək lazım gələrsə, səlatı saxlamaq bu mənaları verir: a) zehni baxımdan fəaliyyət göstərmək üçün təlim-tərbiyə məkanları olan məktəblərin, müxtəlif kursların, təhsil mərkəzlərinin açılması və onlara dəstək verilməsi; b) maliyyə baxımından, iş yerlərinin açılması, sosial təminat sistemlərinin

qurulması, yoxsullara və yetimlərə yardım etmək, subay və dulları evləndirmək kimi işlərin görülməsi məqsədiylə müvafiq qurumların təşkil edilməsi və onlara dəstək verilməsi. "Təbyinül-Quran"da bu barədə ətraflı məlumat verilmişdir.

**TƏQVA** – Allahın mühafizəsi altına daxil olmaq.
"İnsanın, özünü Allahın mühafizəsi altına daxil edərək yaxşı əməl işləməsi, günahlardan uzaqlaşması, bununla da axirətdə ona ziyan və əzab verəcək şeylərdən özünü qoruması" mənasına gələn "təqva" Quranda əvvəlcə "şirkdən qaçmaq" və "axirətə inanmaq" mənasında işlədilmiş, daha sonra da imanı özündə əks etdirən bütün əməlləri ehtiva edəcək şəkildə genişləndirilmiş bir qavramdır. Buna görə də biz "təqva"nı "Allahın mühafizəsi altına daxil olmaq", "müttəqi"ni isə "Allahın mühafizəsi altına daxil olan şəxs" kimi tərcümə etdik.

**SƏCDƏ ET, SƏCDƏ EDİN** – Boyun əyib təslim ol. Boyun əyib təslim olanlar olaraq yerlə bir olun; heç olun.

**QOPUQ, RABİTƏSİZ HƏRFLƏR (MƏS: ƏLİF, LAM, MİM; NUN; YA SİN; ƏLİF, LAM, RA.)** - Quranda bir çox surənin "qopuq, rabitəsiz hərflər" ilə başladığını görürük. Müxtəlif şəxslər bu hərflərin mütəşabeh, şifr, bir sözün qısaldılmış forması, bəzi sözlərin ilk və yaxud son hərfi olduğu haqqında fikirlər önə sürülmüşdür. Bizə görə bu hərflər "əla" [diqqət, gözünüzü açın] sözü kimi bir xəbərdarlıq işarəsidir və telefon danışıqlarındakı "alo" nidası kimi, oxunacaq ayələrə diqqət çəkmək üçündür. Ayrıca, Quranın riyazi quruluşundakı vacib ünsürlərdən biridir. Digər tərəfdən, bu hərflərin ədədi dəyərləri ifadə etməsi də mümkündür. Çünkü Quranın nazil olduğu dövrdə Ərəblər arasında rəqəmlər icad olunmamışdı, rəqəm yerinə hərflərdən istifadə olunurdu. Rəqəm yerinə hərflərin işlədilməsinə "əbcəd" hesabı deyilir. Biz rabitəsiz hərflərin yanında, onların ədədi dəyərlərini də göstərdik. Bu ədədi dəyərlərin nəyi göstərdiyi barədə hələlik bir qənaətə gəlməmişik. "Əbcəd" hesabı, Quranın nazil olduğu dövrdə rəqəm yerinə işlədilmək xaricində, hər hansı bir keyfiyyətə və xüsusiyyətə malik deyil.
Bu rabitəsiz hərflərlə bağlı qane edici bir tədqiqat hələ ki, meydana qoyulmamışdır və mövcud əsərlərdə, keçmişdəki yozumların nəqlindən başqa bir məlumat yoxdur. Bu məsələnin aydınlaşdırılması da, digər bir çox məsələ kimi, dürüst, səmimi və könüllü Quran tədqiqatçılarını gözləyir.

**AND İÇİRƏM, AND OLSUN** – Sübut gətirirəm, sübutdur ki.
Bir iddianı konkret dəlillərlə qüvvətləndirmək üçün ərəb dilində "qəsəm cümləsi" adlı bir cümlə növü işlədilir. Yəni "qəsəm cümləsi" bir iddianın dəlillərlə qüvvətləndirilmiş olaraq meydana qoyulması məqsədi ilə qurulan cümlədir. Qəsəm cümləsi iki hissədən ibarət olur. Birincisi and içilən [dəlil, şahid göstərilən] "qəsəm hissəsi", ikincisi isə ifadə edilmək istənilən əsas iddianın meydana qoyulduğu "qəsəmə cavab hissəsi"dir. And hissəsində, ikinci hissədə meydana qoyulacaq iddianı dəstəkləmək məqsədi ilə şəxslər, hadisələr yaxud əşyalar dəlil göstərilir. Qəsəmə cavab hissəsində isə nəzərdə tutulan əsl hökm ifadə edilir. Bu cümlələrin quruluşu da digər cümlələrin quruluşundan fərqlidir. Bunlar "Təbyinül-Quran"da detallı bir şəkildə göstərilmişdir.
Bu cümlə növü Quranda yüz dəfələrlə işlədilmişdir. Rəbbimiz bir çox hadisəyə, sistemə yaxud da "şey"ə qəsəm etmiş və bunları, ifadə etdiyi hökmə dəlil göstərmişdir.

**NÖVBƏTİ SERİYADA ARDI VAR...**

# ALLAHI İSİMLƏRİ İLƏ TANIYAQ



## Sizi Yaradan Allahı Nə Qədər Tanıyırsınız?

Sizi kim yaratdı? Sizə bədəninizi, gözlərinizin, saçlarınızın rəngini kim verdi? Boyunuzun uzunluğunu, saçlarınızın rəngini kim təyin etdi? Sizinlə birlikdə digər insanları, göyləri, yeri və bu ikisinin arasında yaşayan bütün canlıları kim yaratdı? Kosmosun dərinliklərindəki planetlərin, Günəşin və ulduzların nizamını kim təyin etdi?

Siz bütün bu suallara sadəcə bir cavab verirsiniz: "Allah". Sizin kimi digər insanlar da bu suallara: "Allah", -deyə cavab verirlər. Necə ki, Allah Quranda insanların öz ağızları ilə bu həqiqəti təsdiq edəcəklərini belə bildirmişdir:

**"Həqiqətən, əgər: "Göyləri və yeri kim yaratmış, günəşi və ayı kim ram etmişdir?" – deyə soruşsan, onlar mütləq: "Allah!" – deyə cavab verəcəklər. Elə isə onlar niyə döndərilirlər?"** (Ənkəbut surəsi, 61)

Yaxşı, sizi və kainatı ən incə detalına qədər planlayan Yaradıcımızı nə qədər tanıyırsınız? Sizi hər an gördüyünü, eşitdiyini, etdiyiniz hər şeydən hər an xəbərdar olduğunu bilirsinizmi? Sizə görə Allah haradadır? Sizi yaratdıqdan sonra öz başınıza buraxır? Yoxsa necə yaşamalı olduğunuzu bildirir? Allahı görə bilərsinizmi? Onunla danışa bilən bir insan varmı? İnsanlardan başqa hansı varlıqları yaratdı? O, ölümdən sonra necə həyat vəd edir?

Şübhəsiz, bunlar kimi daha bir çox sual verilə bilər və siz də bu sualların hamısını cavablayarsınız. Bu cavablar ya ailənizdən, qohumlarınızdan və ətrafınızdan, ya da oxuduğunuz kitablardan öyrəndikləriniz olacaq. Yaxud da illər əvvəl din dərsində oxuduqlarınızdan ağlınızda qalanlar... Yaxşı, verdiyiniz cavabların, həqiqətən, doğru olub-olmadığını heç düşünmüsünüzmü?

Şübhəsiz, hər kəs Allah haqqında çox fərqli fikirlər söyləyə bilər. Fəlsəfəçi Allahı izah edərkən əvvəlcə aldığı təhsili ön plana çıxarır, təsirləndiyi filosofların fikirlərindən istifadə edərək Allahı tanıdır. Allah haqqında heç bir məlumatı olmayan evdar qadın qonşusundan eşitdiyi məlumatlara inanır. Allahla əlaqədar kitab yazan yazıçı isə bəlkə də heç din təhsili almayıb, hətta Allahın endirdiyi ayələrdən birini belə bilmir. Lakin bu yazıçının kitabını oxuyan hər kəs sanki onun fikirləri tamamilə doğru imiş kimi qəbul edir, bütün yazılanları tətbiq edir və ətrafındakı hər kəsə özündən çox əmin olaraq oxuduqlarını izah edir. İnsanların çoxu o günə qədər ətrafından eşitdiklərinin və öyrəndiklərinin səhv və ya əskik ola biləcəyinə ehtimal vermir.

Lakin unudulmamalıdır ki, insan səhv edə, cahillik edə bilər. Bu halda, bizə Allahı ən doğru tanıdacaq qaynaq yalnız Onun bizlərə endirdiyi haqq kitab Qurandır. Allah Quranda insanların öyrənməli olduqları şeyləri açıqlamışdır. Yuxarıdakı sualların Qurandakı cavablarına baxsaq, əvvəlcə, Allahın yalnızca göylərdə deyil, hər yerdə olduğunu görərik. Allah bütün insanlara olduğu kimi, sizə də şah damarınızdan daha yaxındır. Sizin hər etdiyinizə şahiddir, hər şeyi görür. Söylədiyiniz bütün sözləri eşidir. İçinizdən etdiyiniz bütün duaları bilir. Hər an sizin yanınızdadır. Üstəlik, Allah dilədiyi qulu

ilə danışır. Məsələn: Quranda, hz. Musa ilə danışaraq onu digər insanlardan üstün etdiyi bildirilmişdir. Allah insanlarla bərabər mələkləri və cinləri də yaratmışdır. Həmçinin Allah dünya həyatından sonra sonsuza qədər davam edəcək cənnət və cəhənnəm həyatı da yaratmışdır. İnsanlara ölümlərindən sonra cənnətə gedə bilmələri üçün necə yaşamalı olduqlarını da Quranla bildirmişdir. Bütün bunlar yuxarıda soruşduğumuz sualların qısa cavabıdır və bu cavabların hamısı Quranda var.

Hazırda, əlinizdə oxuduğunuz bu yazı da sizə şah damarınızdan daha yaxın olan Allahı Quranda bildirdiyi şəkildə tanıtmaq üçün yazılmışdır. Bu yazının məqsədi ağlınızdakı yanlış məlumatların yerinə Qurani-kərimdəki həqiqi Allah inancını yerləşdirmək, beləliklə, uca Allah'ı daha yaxşı tanımanızı, Ona daha yaxın olmanızı təmin etməkdir. Allah 1400 il əvvəl endirdiyi Quran ayələri ilə insanlara Özünü tanıtmış, Özünə aid adları bildirmişdir. Quranda verilən müxtəlif nümunələr və izahlar Onun sonsuz ağlını, elmini, sənətini göz önünə gətirir. Allah Quran ilə Özünü qullarına tanıdır.

Bu yazıda yerləşən hər adın altında istifadə edilən ayələr açıqlanan adın keçdiyi ayələrdir. Bu ayələrin ərəbcəsinə baxsaq, Allah'ın bu adlarının ayələrin içində keçdiyini görərik. Bundan başqa, hər ismin altında, bəlkə də bu günə qədər üzərində düşünülməyən detalları xatırladacaq qısa açıqlamalar var. Əlbəttə, bu açıqlamalar göylərin və yerin Rəbbi olan Allah'ı tanıtmaq üçün kifayət deyil. Çünki bütün kainatı, bütün canlıları, insanları və maddəni yaradan və ən gözəl adların sahibi olan Allah'ın sadəcə bir adını açıqlamaq üçün belə cildlərlə kitab yazıla bilər. Lakin belə imkan olmadığı üçün bu yazıda qısa nümunələrdən, insanı düşünməyə sövq edəcək izahlardan istifadə edilərək oxucunun təfəkkürü açılmağa çalışılır.

Əlinizdəki yazı ilə əlaqədar gözdən qaçırılmamalı daha bir cəhət var: bu yazı sizə yalnız Quranda keçən məlumatları çatdırır. Çünki Allahın adları haqqında Onun Quranda bizə öyrətdiyindən başqa heç bir məlumatımız yoxdur. Bizə məlum olmayanlar isə Rəbbimizin qatında gizlidir:

**"Onlar: "Sən paksan, müqəddəssən! Sənin bizə öyrətdiklərindən başqa biz heç bir şey bilmirik. Bilən Sən, hikmət sahibi Sənsən", - dedilər."**

(Bəqərə surəsi, 32)

## ƏDL

### Adil olan, ədaləti əmr edən

**"Ey iman gətirənlər! Allah qarşısında sabitqədəm və ədalətli şahidlər olun. Hər hansı bir camaata qarşı olan kininiz sizi ədalətsizliyə sövq etməsin. Ədalətli olun. Bu, təqvaya daha yaxındır. Allahdan qorxun. Allah etdiklərinizdən xəbərdardır!"**

(Maidə surəsi, 8)

Allah ədalətlilərin ən xeyirlisidir. Onun nizamı bütün kainatı ehtiva etmişdir. O, ədalətini dünyada və axirətdə qullarına göstərəcək. Hər şeyi haqqı ilə görən, hər şeyin daxilini, xaricini bilən, hər şeydən xəbərdar olan Allahın bütün işləri hikmətli və ədalətlidir.

İnsanların həyatları boyu işlədikləri bütün əməllər mütləq Allahın ədalətinə görə qiymətləndiriləcək. Allah Quranda zülm edənlərin zülmlərinin qarşılıqsız qalmayacağını, yaxşı bir sözün belə mükafatının veriləcəyini xəbər verir. Bütün bunların ədalətlə qiymətləndiriləcəyi yer axirətdir; Allah'ın sonsuz ədalətinin təcəlli edəcəyi yer...

Dünya həyatında inkarçıların peyğəmbərlərə və möminlərə yaratdıqları çətinliklər, atdıqları şərlər, işlədikləri günahlar qarşılıqsız qalmayacaq. Möminlərin cənnətdəki dərəcələrini yüksəldən bütün bu çətinliklər, inkarçıların da cəhənnəmin ən alt təbəqələrinə düşmələrinə vəsilə olacaq.

Allah hesab günündə son dərəcə həssas tərəzilərlə heç kimə haqsızlıq etməyəcək, dünyada onlara verdiyi vaxtın sonunda sonsuz ədalətinə uyğun olaraq hesabını görəcək. Şübhəsiz, Allah hər şeyi bilən və vədinə ən sadiq olandır. İnsanlar dünyada etdiklərinin qarşılığını axirətdə mütləq görəcəklər. Beləliklə, inkarçılar əməllərinin qarşılığını ən ağır şəkildə tapacaq, Allaha imanlarında və bağlılıqlarında qərarlı olanlar isə etdiklərinin qarşılığını ən gözəli ilə Allahdan alacaqlar. Ayədə belə buyurulur:

**“Sənə beyət edənlər, şübhəsiz ki, Allaha beyət etmiş olurlar. Allahın əli onların əllərinin üstündədir. Kim (beyəti) pozsa, ancaq öz əleyhinə pozmuş olar. Kim Allahla etdiyi əhdi yerinə yetirsə, (Allah) ona böyük mükafat verər!”** (Fəth surəsi, 10)

Ancaq burada üzərində diqqətlə düşünülməli cəhət var. Allahın ədalətini düşünərkən bu, qətiyyən insanların ədalət anlayışı ilə müqayisə edilməməlidir. Çünki inkar edən insan istəkləri və zəiflikləri qarşısında aciz qala bilər, ədalətli olmağa çalışarkən emosionallıq edə bilər, bir mövzu haqqında səhv hökmlər verə bilər və etdiklərini unuda bilər. Ən vacibi də qarşısındakının içindən keçirdiklərini bilməsi mümkün deyil. Allah isə əsla səhv etməz və əsla unutmaz. Allah hər insan üçün onun hərəkətlərinə nəzarət edən və əməllərini yazan mələklər təyin edib. Bu mələklər insanların həm içindən keçəni, həm də bütün hərəkətlərini yazırlar. Nəticə olaraq, Allah insanın ruhuna tamamilə hakimdir. Ən ədalətli hökm verəcək olan da Rəbbimizdir. “İsra” surəsinin 71-ci ayəsində Allahın sonsuz ədalət sahibi olduğu belə xəbər verilir:

**“Bir gün bütün insanları öz imamları ilə birlikdə çağıracağıq. Əməl dəftərləri sağ əllərinə verilənlər onu oxuyar. Onlara tük qədər haqsızlıq edilməz.”** (İsra surəsi, 71)

Bütün pisliklərin, inananların əleyhinə qurulan qruplaşmaların, hazırlanan tələlərin qarşılığı ən kiçik detalına qədər axirətdə veriləcək. Əslində, Allah inkarçılara dünya həyatında yalnızca onların pisliklərini artırmağa səbəb olacaq mal, mülk, zənginlik və bunun kimi bir çox imkan verə bilər. Allah ayələrində bunlara aldanmamağı bildirmişdir. Çünki qısa dünya həyatındakı mənfəətin axirətdəkinin yanında heç bir mənasının və əhəmiyyətinin olmadığı, şübhəsiz, həqiqətdir. Həm də sonsuz cəhənnəm inkarçılara get-gedə yaxınlaşarkən...

Əsl yurd olan axirətdə hər nəfs etdiklərini qarşısında hazır tapacaq. Allah sonsuz ədalətinin təcəllisini qullarına cənnət və cəhənnəmində sonsuza qədər göstərəcək. Allah ən sonunda Özünə inananlarla inanmayanların arasını haqq ilə ayıracaq.

**“Allah din yolunda sizinlə vuruşmayan və sizi yurdunuzdan çıxartmayan kimsələrə yaxşılıq etməyi və onlarla ədalətlə rəftar etməyi sizə qadağan etməz. Allah ədalətli olanları sevər!”** (Mumtəhinə surəsi, 8)

**“Allah sizə əmanətləri öz sahiblərinə qaytarmanızı və insanlar arasında hökm etdiyiniz zaman ədalətlə hökm etmənizi əmr edir. Həqiqətən, Allah’ın bununla sizə verdiyi öyüd necə də gözəldir! Əlbəttə, Allah eşidəndir, görəndir!”** (Nisa surəsi, 58)

**“Onlar yalana qulaq asanlar və haram yeyənlərdir. Əgər yanına gəlsələr, aralarında hökm et və ya onlardan üz çevir. Əgər onlardan üz döndərsən, sənə heç bir zərər verə bilməzlər. Əgər aralarında hökm etsən, ədalətlə hökm et. Allah ədalət sahiblərini sevər!”** (Maidə surəsi, 42)

**“De: “Rəbbimiz bizi toplayacaq və aramızda ədalətlə hökm edəcəkdir. Ədalətlə hökm edən, bilən ancaq Odur!””** (Səba surəsi, 26)

**“Ey iman gətirənlər! Özünüzün və ya valideynlərin, ya da yaxın qohumların əleyhinə olsa belə, Allah şahidləri kimi**

**ədaləti qoruyun. (Əleyhinə şahidlik edəcəyiniz şəxslərin) varlı və ya kasıb olmasından asılı olmayaraq, Allah onların hər ikisinə daha yaxındır. Hissiyyata qapılıb haqdan uzaqlaşmayın! Əgər siz (cəfəngiyat) danışsanız və ya (həqiqəti deməkdən) boyun qaçırsanız, bilin ki, Allah nə etdiklərinizdən xəbərdardır.”**

(Nisa surəsi, 135)

## ƏFÜVV

### Əfvi çox olan

**“Əgər yaxşı bir əməli aşkara çıxarsanız, yaxud onu gizlətsəniz və ya bir pisliyi əfv etsəniz (Allah onları bilər). Həqiqətən, Allah bağışlayandır, qüdrət sahibidir!”** (Nisa surəsi, 149)

İnsan, yaradılış etibarı ilə səhv etməyə meyilli varlıqdır. Hər an bir çox mövzuda qüsurlu düşünə bilər, səhv qərar verə bilər, xəta edə bilər. Ancaq insanı yaradan və ondakı bu çatışmazlıqları bilən Allah edilən səhvləri də əfv edəndir. Allahın əfvi olmazsa, heç bir insanın cənnətə girməsi mümkün olmazdı. Bu həqiqətə Quranda açıq-aşkar diqqət çəkilir:

**“Əgər Allah insanları zülmləri üzündən cəzalandırsaydı, yer üzündə heç bir canlını sağ buraxmazdı. Lakin (Allah) onlara müəyyən müddət möhlət verər. Əcəlləri gəlib çatdıqda isə bircə saat belə nə geri qalar, nə də irəli keçə bilərlər.”** (Nəhl surəsi, 61)

Lakin unudulmamalıdır ki, Allah’ın əfvediciliyi səmimi qullarına aiddir. O, Özünə səmimi yönələn insanların günahlarını əfv edər. Əhəmiyyətli olan insanın səmimi olub qəti şəkildə tövbə etməsidir. Yoxsa tövbə edib təkrar əvvəlki səhvlərinə geri qayıdanların və etdiklərindən həqiqi peşmançılıq hiss etməyənlərin tövbəsini qəbul etməyəcəyini Allah bir ayədə belə bildirir:

**“Allah yanında yalnız o kəslərin tövbəsi qəbul olunar ki, onlar nadanlıq ucundan pis bir iş gördükdən sonra dərhal tövbə edərlər. Allah belələrinin tövbəsini qəbul edir! Həqiqətən, Allah biləndir, hikmət sahibidir!”**

(Nisa surəsi, 17)

## AXIR

### Hər şey yox olandan sonra da var olan

**“Əvvəl də, Axır da, Zahir də, Batin də Odur. O, hər şeyi biləndir!”**

(Hədid surəsi, 3)

Allah kainatı yoxluqdan yaradıb və onu ən sonda yenə əvvəlki vəziyyətinə qaytaracaq, yox edəcək. Yox olmayacaq heç bir əşya, ölümsüz olan heç bir canlı mövcud deyil. Dünyadakı bütün canlılar doğulur və ölür, hər şeyin bir ömrü, müddəti var. Halbuki, Quranda bildirildiyi kimi, Allah əvvəldir, axırdır, yəni başlanğıcı olmadığı kimi, sonu da yoxdur. Hər şey yox olduqdan sonra baqi qalacaq olan da Odur.

Ömrü və zamanı yaradan Allah maddəyə aid bütün bu xüsusiyyətlərdən uzaqdır. O, əvvəli və sonrası olmayandır. Sonsuzluğun sahibi, zamana və məkana tabe olmayan Allahdır. Nəticədə, kainat təkrar başlanğıc nöqtəsinə dönəcək, canlı-cansız heç bir şey qalmayacaq. Yalnız Allahın varlığı baqi qalacaq. Allah bu həqiqəti Quranda bu cür bildirir:

**“(Yer) üzündə olan hər kəs fanidir. Ancaq əzəmət və kərəm sahibi olan Rəbbinin zatı baqidir.”**

(Rəhman surəsi, 26-27)

**“Göylərdə və yerdə olanların hamısı Allahın şəninə təriflər deyir. O, qüdrətlidir, müdrikdir. Göylərin və yerin hökmranlığı Ona məxsusdur. O, həm diriltdir, həm də öldürür. O, hər şeyə qadirdir.** (Hədid surəsi, 1-2)

**“Göyləri və yeri altı gündə yaradan, sonra da ərşə ucalan Odur. O, yerə girəni də, oradan çıxanı da, göydən enəni də, oraya qalxanı da bilir. Siz harada olsanız belə, O, sizinlədir. Allah sizin nə etdiklərinizi görür.”**

(Hədid surəsi, 4)